Azərbaycan Milli Elmlər Akademiyasının Nəsimi adına Dilçilik İnstitutunun Elmi Şurasının qərarı ilə çap olunur

**Elmi redaktor:** filologiya elmləri doktoru, professor M.Ə.Mahmudov

**Rəyçilər:** filologiya elmləri doktoru, professor H.M.Zərbəliyev

filologiya elmləri namizədi E.S.İnanc

Monoqrafiyada dillərin qohumluğunun əsas meyarları müəyyənləşdirilmiş və bu baxımdan Altay dilləri müqayisəli yolla tədqiq edilmişdir. Tədqiqat işində Altay dil ailəsinə daxil olan dillərin qohumluğunu sübut etməyə imkan verən uyğunluqlar aşkar edilmiş və konkret faktlarla izah olunmuşdur. Eyni zamanda bu dillərin qohumluq dərəcəsi müəyyənləşdirilmişdir.

Monoqrafiya filoloq-dilçilər, aspirantlar və ali məktəblərin filologiya fakültəsinin tələbələri üçün nəzərdə tutulmuşdur.

# GİRİŞ

Dünyada mövcud olan minlərlə dilin daha dərindən, sistemli şəkildə tədqiqata cəlb olunub öyrənilməsi üçün dünya dillərinin təsnif edilməsinin müstəsna əhəmiyyəti vardır. Çünki müxtəlif dillər təsnif edilərkən onların quruluşları arasında elmi müqayisələr aparılır, ayrı-ayrı dillər üçün səciyyəvi olan müəyyən əlamət və xüsusiyyətlər ümumiləşdirilir və beləliklə, dillərin müəyyən sistem şəklində öyrənilməsi üçün şərait yaranır.

Dilçilikdə dünya dilləri müxtəlif baxımdan–qohumluğa (genealoji təsnifat), əraziyə (areal təsnifat), funksiyaya (funksional təsnifat), fonetik sisteminə və lüğət tərkibinə, qrammatik quruluşuna (morfoloji təsnifat) və s. görə təsnif edilmişdir. Bunlar müəyyən mərhələlərdə əsas təsnifat prinsipləri olsalar da, dillərin sistem şəklində öyrənilməsi üçün əhəmiyyətli rol oynaya bilməmişlər. Hal-hazırda hələ ki, bu təsnifatlardan yalnız ikisi–morfoloji və genealoji təsnifat dünya dilçilərinin əksəriyyəti tərəfindən məqbul hesab edilərək inkişaf etdirilmişdir.

Məlumdur ki, morfoloji təsnifat dillərin qrammatik quruluşuna əsaslanır. Dilin morfoloji səviyyəsi digər səviyyələrə nisbətən daha dayanıqlı olduğundan dünya dillərinin morfoloji təsnifatı bir çox tədqiqatçılar tərəfindən dəqiq bölgü kimi qiymətləndirilmişdir. Lakin ümumilikdə dilçilik tarixində dillərin morfoloji təsnifatına dair yekdil fikir olmamışdır. Ayrı-ayrı tədqiqatçılar (A.Şlegel, H.Şteyntal, V.Humboldt, E.Sepir, C.Qrinberq) tərəfindən morfoloji təsnifatın təkmilləşdirilməsinə göstərilən səylərə baxmayaraq, bu bölgünün nöqsanları hələ də aradan qalxmamışdır.

Morfoloji təsnifat, dillərin qrammatik quruluşunun müqayisəli şəkildə öyrənilməsi, müxtəlif dillərin strukturları

arasındakı oxşar və fərqli cəhətlərin müəyyənləşdirilməsi və qruplaşdırılması başqa bir bölgünün – genealoji təsnifatın sürətli inkişafına təkan verdi.

Məlumdur ki, müasir dillər uzun inkişaf yolunun–inteqrasiya və diferensiasiyanın nəticəsidir. Buna görə də onların bir-birinə qohumluğunu müəyyən etmək dilçilik elmi üçün kifayət qədər vacib məsələlərdəndir. Dillərin mənşəyinə və qohumluğuna görə təsnif edilməsinə (genealoji təsnifata) bir qədər əvvəldən başlanılsa da, XIX əsrin əvvəllərində yaranmış və dilçilik tarixində böyük hadisə hesab olunan müqayisəli tarixi metod dünya dillərinin genealoji təsnifatına əsaslı elmi zəmin yaratdı.

Dünya dillərinin elmi təsnifinə (həm morfoloji, həm də genealoji) Avropada başlanılmışdır. Bu, o dövr idi ki, Qərb əsrlər boyu Şərqdən öyrəndiyini inkar edir, ilk sivilizasiyanın və bütün elmlərin məhz Avropada yarandığı iddia edirdi. Təbii ki, digər sahələr kimi, ideologiya ilə sıx bağlı olan dilçilik elmi də avropasentrizmin təsirindən yaxa qurtara bilməzdi. Məhz bu təsirin nəticəsi idi ki, dünya dilləri morfoloji baxımdan təsnif edilərkən flektiv dillərdən başqa digər dillərin (xüsusilə iltisaqi dillərin) mövqeyi arxa plana keçirilmiş, onların qrammatik quruluşundan ötəri danışılmış (yalnız müqayisə zamanı ehtiyac duyulduqda), əvəzində flektiv dillər «mükəmməl», «kamil» (V.Humboldt), «inkişafın yüksək pilləsi» (A.Şleyxer) kimi mədh olunmuşdu. Hətta H.Şteyntal iltisaqi dillərdə (Ural-Altay dillərində) mövcudluğunu qoruyub saxlayaraq dəmir qanuna çevrilmiş ahəng qanununu «Ural-Altay xalqlarının fikri və zehni tənbəlliyinin» [4,34] nəticəsi kimi təhqiramiz formada dəyərləndirmişdi.

Genealoji bölgüdə də birtərəfli mövqe özünü bariz surətdə göstərir. Tutarlı dəlillərə əsaslanmayan cüzi və ötəri oxşarlıqlar, bəsit

etimoloji izahlar, sistem təşkil etməyən qanunauyğunluqlar əsasında flektiv dillərin (eyni zamanda dünya dillərinin, demək olar ki, yarısını) özündə birləşdirən dil ailəsini (hind-Avropa dil ailəsi) yaradan, hər vəchlə onun sərhədini genişləndirən və şifrəsi açıldıqca bir qədim dili buraxıb, digərini öz əcdad dili, yaxud onun varisi elan edən hind-avropaşünaslar digər dillərin qohumluğu məsələsində müqayisəli-tarixi metodun bütün tələblərini tətbiq etməyin vacibliyini israr etmişlər. O tələblər ki, yalnız hind-Avropa dillərinə tətbiq ediləndə özünü doğruldur və yalnız bu dillərin qohum olmasını sübut etmək üçün seçilmişdir. Mərhum türkoloq A.Məmmədovun qeyd etdiyi kimi, «… Linqvistik təsvirlərin söykəndiyi ənənəvi anlayışlar sistemi bilavasitə Avropa dillərinin (xüsusən flektiv-sintetik dillərin) əlamətləri əsasında formalaşmış, dilin tarixini xalqın tarixi ilə əlaqədə öyrənməyə çağıran tarixi diliçilik isə Avropa və Asiyanın qədim mədəni mərkəzlərinin əksəriyyətində hind-Avropa dillərində danışan xalqları «məskunlaşdırmışlar»» [13, 5].

İltisaqi dillərin (söhbət türk, monqol, tunqus-mancur dillərindən gedir) qohumluğu və onların Altay dil ailəsi deyilən dünyanın ən böyük dil ailələrindən birində birləşməsi məsələsi də hind-avropaşünasların və hind-avropaşünas kimi düşünən bəzi altayşünasların (əslində onlar tədqiq etdikləri dillərə ümumaltay konteksindən yanaşa bilməmiş və onları təcrid olunmuş dillər kimi qəbul etmişlər) «qısqanclığı» nəticəsində öz həllini tam tapa bilməmişdir. Elə buna görə də XVIII əsrin əvvəllərindən irəli sürülmüş Altay dillərinin qohumluğu nəzəriyyəsi (altayşünaslıq nəzəriyyəsi) hələ də mübahisəli olaraq qalır.

Yarandığı gündən (ilkin dövrləri çıxmaq şərtilə) altayşünaslıq nəzəriyyəsi müqayisəli dilçilikdə və türkologiyada birmənalı qarşılanmamışdır. Hal-hazırda da bu nəzəriyyəyə iki baxış

mövcuddur: pozitiv və skeptik. Pozitiv mövqeli altayşünaslar göstərirlər ki, Altay dilləri (Koreya və yapon dilləri də buraya daxil edilir) arasındakı maddi, tipoloji yaxınlıq onların genetik qohumluğundan irəli gəlir. Tarixin müəyyən bir dövründə (mütəxəssislərin fikrincə, bu dövr ən azı iki min il bundan əvvələ aid olmalıdır) ulu Altay dili mövcud olmuşdur. Sonrakı inkişaf və parçalanma nəticəsində həmin ulu dil müasir Altay dillərinə bölünmüşdür. Lakin sonralar da bu dillər bir-birindən təcrid olunmuş şəkildə yaşamamış, uzun müddət qarşılıqlı əlaqədə olmuşlar. Altay dillərinin qohumluğuna və ulu Altay dilinin mövcudluğuna şübhə ilə yanaşanlar isə (skeptiklər, bəzən onlara neoaltayşünaslar da deyirlər) bu uyğunluğu sadəcə olaraq tipoloji uyğunluq hesab edirlər. Onlar sübut etməyə çalışırlar ki, sturuktur cəhətdən bir sıra uyğunluqları olan bu dillər eyni inkişaf yolu keçmişlər və güclü qarşılıqlı əlaqələr nəticəsində bir-birilərinə həddindən artıq yaxınlaşmışlar. Müşahidə olunan maddi yaxınlıq da bunun nəticəsidir.

Pozitiv altayşünasların ən görkəmli nümayəndələri N.N.Poppe, B.Y.Vladimirsov, Y.D.Polivanov, Q.İ.Ramstedt olmuşlar. Onlar nəinki altayşünaslıq nəzəriyyəsini inkişaf etdirmiş, hətta inandırıcı və uğurlu tədqiqatlarla onun sərhədlərini genişləndirmişdirlər.

Altay dillərinin qohum olması fikrinin tərəfdarları indi də çoxluq təşkil edirlər. Buraya görkəmli türkoloqlar, monqol-şünaslar və tunqus-mancurşünaslar (Q.Vinkler, P.Aal-to, V.İ.Sinsius, O.P.Sunik, İ.V.Kormuşin, A.N.Kononov, N.A. Baskakov, V.D. Kolesnikova, K.Kenesbayev, S.C.Nomin-xanov, D.İ.Nasilov, A.P.Dulzon, E.A.Makayev, N.A.Sıramyat-nikov, S.A.Starostin və s.) daxildirlər.

Altayşünaslıq nəzəriyyəsinə skeptik mövqedən yanaşanların ən görkəmli nümayəndəsi isə polyak dilçisi V.Kotviç hesab olunur. V.Kotviç Altay dillərini müqayisəyə cəlb edərək onların genetik cəhətdən qohum deyil, tipoloji cəhətdən uyğun olması fikrini irəli sürmüşdür. V.Kotviçdən sonra bir sıra dilçilər onun gəldiyi nəticə ilə razılaşaraq Altay dillərini qohum hesab edənləri tənqid etmişlər. Həmin dilçilər sırasına  A.Şerbak, C.Klouson, G.Dörfer, L.Liqeti, Q.Sanjeyev və başqaları daxildirlər. Əvvəlcədən qeyd edək ki, skeptik altayşünaslar Altay dillərinin qohumluğunu inkar edərkən əsasən bu dillərin leksik səviyyəsindəki uyğunsuzluq mövqeyindən çıxış edirlər.

Hal-hazırda Altay dillərinin qohumluğunu qəbul edənlərlə etməyənlər arasındakı nisbət əlli-əlliyədir.

Azərbaycan dilçiliyində Altay dillərinin qarşılıqlı münasibətinə bəzi dilçilər (Ə.Abdullayev, F.Zeynalov, A.Axundov, A.Qurbanov, T.Hacıyev, A.Məmmədov, F.Cəlilov, B.Xəlilov və s.) müəyyən məqamlarda toxunsalar da, onların tədqiqatları monoqrafik səciyyə daşımadığından dilçiliyimizdə bu sahə ilə bağlı xüsusi tədqiqata ehtiyac duyulurdu. Monoqrafiya ölkəmizdə altayşünaslığa həsr olunmuş ilk müstəqil tədqiqat işi olduğundan, təbii ki, burada müəyyən  qüsarlar da mövcud ola bilər. Bununla bağlı təklif və rəylərini müəllifə göndərəcək oxuculara əvvəlcədən minnətdarlığımızı bildirirk.

**Ünvan: AZ 1143, Bakı, H.Cavid prospekti 31, V mərtəbə, AMEA Nəsimi adına Dilçilik İnstitutu**

## I FƏSİL

## DİLÇİLİKDƏ DİLLƏRİN TƏSNİFİ PRİNSİPLƏRİ VƏ ALTAY DİLLƏRİ

Dünya dilləri qruplaşdırılıb təsnif olunarkən onların müəyyən əlamətləri – yaranması, yayılması, inkişaf etməsi, istifadə olunması, mənşə ümumiliyi, ədəbi səviyyəsi, qrammatik uyğunluğu və s. kimi cəhətləri nəzərə alınır. Belə əlamətlər, səciyyəvi cəhətlər dillərin təsnifi prinsiplərini yaradır [10, 15].

### 1.1. Morfoloji təsnifat və Altay dillərinin qrammatik quruluşu

Dilçilik tarixində ən geniş yayılmış təsnifatlardan biri morfoloji təsnifatdır. Bu təsnifatın bir çox çatışmazlıqlarına baxmayaraq, müxtəlif dillərin morfoloji strukrturundakı xüsusiyyətləri izah etməyə imkan verir. Eyni zamanda dillərin morfoloji quruluşuna əsaslanan bu təsnifatın geniş yayılmasının əsas səbəbi odur ki, dilin morfoloji səviyyəsi digər səviyyələrə nisbətən daha sabitdir, onun dəyişikliyə uğraması üçün uzun zaman tələb olunur və buna görə də dillərin asanlıqla qruplaşdırılmasına imkan yaradır. Morfoloji təsnifatın əsasında sözləri təşkil edən morfemlər (kök və şəkilçi) və onların bir-biri ilə birləşməsinin xüsusiyyətləri, qarşılıqlı münasibətləri durur.

Hal-hazırda nəzəri dilçiliklə məşğul olan əksər tədqiqatçılar dünya dillərinin ənənəvi olaraq (hələ XIX əsrdə V. Humboldt və A. Şlegel tərəfindən irəli sürülmüş morfoloji təsnifata əsasən) dörd tipə bölünməsini qəbul edirlər:

1. Kök və ya amorf dillər (Çin, Tibet, Birma dilləri);
2. İnkorporlaşan dillər (çukot-kamçatka dilləri və s.);
3. Flektiv dillər (hind-Avropa dilləri, sami dilləri və s.)
4. İltisaqi dillər (Ural-Altay dilləri, bantu dili və s.)

Altay dillərinin (xüsusən türk dillərinin) strukturuna ilk elmi baxış uzaq keçmişdən başlanmışdır. Hələ XI əsrdə məşhur türkoloq Mahmud Qaşğarlı «Divani luğat-it-türk» əsərində türk dillərinin ərazi bölgüsünə əsasən təsnifatını vermişdir. O, saf olan və saf olmayan dillər adı altında türk dillərini iki böyük qrupa ayırır [Bax: 11, 57]. Burada mənşə etibarı ilə təmiz türklərin və sonradan türkləşən xalqların dili nəzərdə tutulur. Birinciyə oğuz, qıpçaq, başkurt və s. dillər, ikinciyə isə xiçay və s. kimi sonradan türkləşən dillər aid

edilir. M. Qaşğarlı türk dillərini fonetik və morfoloji əlamətlərinə görə də təsnif etmişdir. Dərin linqvistik təhlillərlə zəngin olan bu əsərdə müəllif türk dillərinin qarşılıqlı müqayisəsini aparmış, onları yarandığı mənşəyə görə də qruplaşdırmağın vacibliyini qeyd etmişdir [Bax: 11, 57].

Dünya dillərinin morfoloji strukturuna əsasən təsnif edilməsinə ilk cəhd göstərən görkəmli alman filoloqu Fridrix Şlegel «Hindlilərin dili və müdrikliyi haqqında» əsərində bütün dünya dillərini iki yerə bölmüşdür: «şəkliçiləşən dillər» (flektiv olmayan dillər anlamında) və flektiv dillər. F.Şleqel flektiv dillərə hind-Avropa və sami dillərini, şəkilçiləşən dillərə isə yerdə qalan digər dilləri aid etmişdir [154]. Tədqiqatçı bölgüsündə flektiv dillərin sərhədini nisbətən dəqiq müəyyən edə bilsə də, morfoloji quruluşuna görə bir-birindən kəskin surətdə fərqlənən dilləri (iltisaqi, amorf və s. tipləri nəzərə almadan) eyni qrupda birləşdirərək təsnifatında böyük qüsura yol vermişdir. Bu fakt onun ya həmin dillər haqqında, ümumiyyətlə, məlumatının olmaması, ya da bütün diqqətini flektiv dilləri digər dillərdən fərqləndirərək həmin dillərin qrammatik quruluşunu izah etməyə yönəltməsi ilə izah etmək olar. Çünki flektiv olmayan dillər arasında şəkilçiləşmə daha çox iltisaqi dillərə (o cümlədən Altay dillərinə) xas olan morfoloji əlamətdir. Buna görə də şəkilçi morfemlərin, demək olar ki, təsadüf edilmədiyi Çin dili ilə Altay dillərinin bir qrupda birləşdirilməsi yanlışlıqdan başqa bir şey deyildir.

Fridrix Şlegeldən sonra Avqust Şlegel «Provansal dili və ədəbiyyatı haqqında qeydlər» əsərində qardaşının təqdim etdiyi bölgüyə öz əlavələrini etmişdir. A. Şlegelin təsnifatındakı əsas fərq budur ki, o, üçüncü dil tipinin («izolə olunmuş» dillərin) mövcud olduğunu göstərmişdir. Digər tərəfdən, A. Şlegel əsas diqqəti

sözdəyişdirici şəkilçilərə deyil, sözdüzəldici şəkilçilərə yönəldərək «şəkilçiləşən» dilləri iltisaqi dillər kimi izah etmişdir [154]. A. Şlegelin təsnifatındakı çatışmayan əsas cəhət ondan ibarətdir ki, onun da bölgüsü dünya dillərinin qrammatik quruluşunu tam ehtiva etmir, fərqli quruluşa malik olan bir çox dillər onun da təsnifatında eyni qrupda birləşdirilir. Eyni zamanda morfoloji şəkilçiləri bir kənara qoymaqla və yalnız sözdüzəldici şəkilçilərə diqqət yetirməklə iltisaqi dillərin xüsusiyyətlərini şərh etməyə göstərilən cəhd bu dillərin strukturunun müfəssəl öyrənilməsinə imkan yaratmır.

Dillərin morfoloji baxımdan təsnifatının növbəti mərhələsi alman tədqiqatçısı Vilhelm fon Humboldtun adı ilə bağlıdır. O, dünya dillərinin dörd tipini müəyyənləşdirmişdir: amorf, iltisaqi, inkorporlaşan və flektiv dillər. V.Humboldt bu tipləri bir-biri ilə müqayisəli şəkildə şərh etmişdir. Onun fikrincə, dil tipinin iki qütbü vardır: 1) izolə olunmuş dil tipi[1]; 2) flektiv dil tipi. İzolə olunmuş dil tipinin son nöqtəsi Çin dili, flektiv dil tipinin son nöqtəsi isə sanskritdir. Digər iki tip (iltisaqi və inkorporlaşan) isə bu tiplərin arasında yerləşir [37, 224]. Lakin buna baxmayaraq, V.Humboldt göstərir ki, «… İltisaqi dillər flektiv dillərdən prinsipial surətdə fərqlənmir…» [37, 125]. Əgər iltisaqi dillərlə flektiv dillər arasında prinsipial fərq yoxdursa, onları ayrı-ayrı dil tipi kimi qeyd etməyin nə əhəmiyyəti var idi? Belə olan halda «fleksiya»nın və «aqqlütinasiya»nın mahiyyətcə eyni dil hadisəsi olması fikri yaranmırmı? Bunları nəzərə alan V.Humboldt flektiv dillərin «xalis fleksiya»lı dillər kimi təqdim olunmasını təklif edir. Lakin buradan belə bir yanlış nəticə çıxır ki, iltisaqi dillər həm də elə flektiv dillərdir, lakin onlarda fleksiya «xalis olmayan fleksiya»dır.

---

[1] аморф дилляр нязярдя тутулур

Ümumiyyətlə, iltisaqi dillərin flektiv dillərdən bu cür fərqləndirilməsini V.Humboldtun tipologiyasının ən zəif cəhəti hesab etmək olar. O, «xalis fleksiya» dedikdə kök morfemlə şəkilçi morfemin birləşməsi texnikasını – fuziyanı nəzərdə tutmuşdur. Məlumdur ki, elmi ədəbiyyatda fuziyanın iki xüsusiyyətini göstərirlər: 1) köklə şəkilçinin bütövlük təşkil etməsi; 2) şəkilçinin çoxmənalılığı [25, 505]. Onun birinci xüsusiyyətinə çox az hallarda rast gəlinir. Bəs ikinci xüsusiyyət iltisaqi dillərlə flektiv dillərin fərqləndirilməsində əsas rol oynaya bilərmi? Müqayisə edək: rus dilində «*ruki*» sözündəki şəkilçi eyni zamanda həm cəm, həm də adlıq hal şəkilçisidir. Azərbaycan dilində «*qollar*» sözündəki şəkilçi isə yalnız cəm şəkilçisidir. Burada adlıq hal ø morfemlə ifadə olunub. Deməli, fuziyanın qeyd etdiyimiz xüsusiyyətlərindən yalnız ikincisi flektiv dillərlə iltisaqi dilləri fərqləndirməyə imkan verir. Lakin bu da həmişə mümkün deyildir, çünki flektiv dillərdə təkmənalı şəkilçilər mövcud olduğu kimi, İltisaqi dillərdə də şəkilçilər hərdən çoxmənalı ola bilirlər. Məsələn, Azərbaycan dilində *«edirlər»* sözündəki *«lər»* şəkilçi eyni zamanda həm cəm, həm də III şəxsin cəmdə şəxs şəkilçisidir. Buradan belə nəticəyə gəlmək olar ki, iltisaqi dillərlə flektiv dillər arasındakı ən böyük fərq fuziyanın dərəcəsindədir. Onların birincisi az, ikincisi isə çox fuziyalıdır.

Dillərin dörd tipə bölünməsi V.Humboldtdan sonra gələn dilçilər tərəfindən heç də həmişə qəbul olunmamışdır. XIX əsrin ortalarında görkəmli alman dilçisi, dilçilikdə naturalizm cərəyanının banisi hesab olunan Avqust Şleyxer yenidən A.Şlegelin dünya dillərinin üçtipli bölgüsünə qayıtmışdır.

A.Şleyxerin təsnifatının əsasında məzmun və münasibət durur. Məzmun dedikdə sözün kökü, münasibət dedikdə isə şəkilçilər nəzərdə tutulur. Məzmun və münasibətin birləşməsi (eyni kök və

şəkilçinin vəhdəti) sözü əmələ gətirir. A.Şleyxer təkamül qanunlarına əsasən dilləri üç yerə bölür: təkhecalı, aqqlütinativ və flektiv dillər. Onun fikrincə, iltisaqi dillərdə məzmun da, münasibət də öz ifadəsini tapa bilir. Ancaq bu dillərdə məzmun və münasibətin vəhdəti tam vəhdət deyildir. İltisaqi dillərdə söz asanlıqla bölünə bilir. A.Şleyxer bu dillərdəki sözü bitkiyə bənzədir [Bax: 16, 183].

Əslində A.Şleyxer də Şleqel qardaşlarının yol verdiyi səhvi təkrarlamışdır. O, bölgüsündə dünya dillərinin tam təsvirini verə bilməmiş, özünəməxsus qrammatik quruluşu olan inkorporlaşan dilləri təsnifatdan kənarda qoymuşdur. Eyni zamanda A.Şleyxerin fikrinin əksinə olaraq qeyd edək ki, iltisaqi dillərdə sözlərin asanlıqla kök və şəkilçiyə ayrıla bilməsinə baxmayaraq, yeni qrammatik forma, yaxud yeni mənalı söz yaradılmasında kök və şəkilçinin tam vəhdət təşkil etməsinin bu dillərdə də möhkəm qanunauyğunluğu vardır. Şəkilçilərin monosemantikliyi bu vəhdəti olduqca sarsılmaz edir.

A.Şleyxerin fikrincə, hər üç dil tipi ümumiyyətlə dil quruluşunun inkişaf tipləri ilə uyğunluq təşkil edir. O göstərir ki, təkhecalı dillər inkişafın ilkin mərhələsini ehtiva edir. Dünya dilləri təkhecalılıq pilləsindən ikinci pilləyə qədəm qoyur və iltisaqi dillər meydana gəlir. İnkişafın ən yüksək pilləsində flektiv dillər dayanır [Bax: 16, 182-185].

Lakin bu müddəada A.Şleyxerin yanıldığı göz qabağındadır. Əvvəla, ona görə ki, tədqiqatçının qeyd etdiyi dil quruluşunun inkişafı təbiətin inkişafına uyğunlaşdırılımışdır (bu çox ehtimal ki, A.Şleyxerin naturalizmindən irəli gəlir), cəmiyyətin, onun inkişaf qanunlarının dilə təsiri isə, demək olar ki, nəzərə alınmamışdır. Digər tərəfdən, A.Şleyxerin müddəasına əsaslansaq, belə bir səhv nəticəyə gələrik ki, təkhecalı və iltisaqi dillər inkişafdadırlar, flektiv dillər isə

yüksək mərhələyə çataraq inkişaflarını dayandırıblar, təkhecalı və iltisaqi dillər müəyyən zaman keçdikdən sonra flektiv dillərə çevriləcəklər. Ancaq öz yaşına görə heç də sanskritdən geri qalmayan və təkhecalı dillərin (A.Şleyxerin təbirincə desək) ən bariz nümunəsi olan Çin dili min illər boyu inkişaf etsə də, nəinki flektiv dilə, heç aqqlütinativ dilə belə çevrilməmişdir. Əksinə, flektiv dillərdə aqqlütinasiyaya və analitizmə meyllilik özünü daha aydın şəkildə büruzə verir. Deməli, hər üç dil tipi ayrı-ayrı dil quruluşunun təzahürləridir və onların inkişafı bir-birini şərtləndirmir.

V.Humboldtdan sonra onun dünya dillərinin təsnifatı haqqındakı prinsiplərini alman dilçisi və nəzəriyyəçisi H.Şteyntal davam etdirmişdir. O, bütün dilləri iki əsas tipə bölmüşdür: formalı dillər və formasız dillər. Bu tiplərin də hər biri iki yarımtipə bölünür: birləşdirici dillər və formadəyişdirici dillər (burda sözlərin formasının dəyişməsi nəzərdə tutulur). H.Şteyntalın fikrincə, formadəyişdirici dillərə bunlar aiddir: 1) önşəkilçi vasitəsilə formadəyişdirən dillər–Polinezeya dilləri; 2) şəkilçi vasitəsilə formadəyişdirən dillər–Ural-Altay dilləri (türk, monqol, fin-uqor və s.); 3) inkorporasiya vasitəsilə formadəyiş-dirən dillər–Amerika dilləri və s. [67, 9].

Təsnifatdan göründüyü kimi, H.Şteyntal məsələni bir qədər də mürəkkəbləşdirərək iltisaqi quruluşu olan Ural-Altay dillərini inkorporlaşan dillər olan Amerika və Uzaq Şərq dilləri ilə bir qrupda birləşdirmişdir. Çox ehtimal ki, H.Şteyntal dilləri təsnif edərkən şəkilçi morfemlərin kök morfemlərlə münasibətini və onların funksiyalarını əsas götürmüşdür.

H.Şteyntaldan sonra dillərin tipoloji bölgüsü bir çox dilçilərin (F.Misteli, F.Fortunatov, F.Fink və s.) əsərlərində öz əksini tapsa da,

dünya dillərinin təsnif olunması ilə sistemli şəkildə Amerika dilçisi E.Sepir məşğul olmuşdur.

Edvard Sepir «Dil» əsərində kök və şəkilçinin müxtəlif münasibətlərinə əsaslanaraq dörd tip daxilində dünya dillərini 21 yarımtipə bölmüşdür [115]. Lakin fikrimizcə, bu təsnifatın da özünəməxsus çatışmayan cəhətləri vardır. Belə ki, E.Sepir dilləri təsnif edərkən bütövlükdə onların qrammatik quruluşuna deyil, kök və şəkilçinin birləşmə texnikasına («fuziya», «aqqlütinasiya», «simvollaşma», «sintez») diqqət yetirmişdir. Eyni zamanda o, bu texnikanı müxtəlif dillərdə izləməyə çalışaraq sonda belə bir nəticəyə gəlmişdir: «Dil eyni vaxtda aqqlütinativ və flektiv, flektiv və polisintetik, hətta polisintetik və izolə olunmuş ola bilər» [115, 96].

Sadaladığımız bu təsnifatlar müxtəlif illərdə ayrı-ayrı tədqiqatçılar tərəfindən ya qəbul edilməmiş, ya da tədqiqat üçün uğursuz hesab olunmuşdur. Bunun da əsas səbəbi «…həmin təsnifatların məhdudluğu, səthiliyi və məlum subyektivliyi…»dir [45,13]. Fikrimizcə, adları çəkilən dilçilərin əksəriyyətinin təsnifatında daha çox flektiv dilləri ön plana çəkməsini, daha çox həmin dillərin qrammatik quruluşunu izah etmək cəhdini də bura əlavə etmək lazımdır.

Qeyd edək ki, bir sıra tədqiqatçılar haqlı olaraq göstərilən tiplər arasında təmiz dil tipi olmadığını göstərmişlər. N.F.Pronçatovun fikrincə, «… morfoloji təsnifata əsasən yaranmış dil qrupları arasındakı sərhəd çox şərti, tez-tez dəyişən və qeyri-müəyyəndir… İdeal təmiz dil qrupu yoxdur… Məsələn, kök dillərdə tez-tez şəkilçilərdən istifadə olunur, flektiv dillərdə isə aqqlütinasiyaya müraciət olunur …» [95, 6]. O.P.Sunik belə bir qənaətə gəlmişdir ki, «əldə olunmuş geniş faktlara əsasən demək olar ki, hər hansı bir dildə və yaxud eyni tipli dillərdə təzahür edən hadisə

başqa tip dillərdə də mövcuddur (məsələn, aqqlütinasiyanın amorf, inkorporlaşan və flektiv dillərdə təzahürü). Buna görə də demək mümkündür ki, dünyada təmiz flektiv, təmiz aqqlütinativ, təmiz inkorporlaşan dil yoxdur» [122, 28]. Dilçilik nəzəryyəsində bir çox tədqiqatçılar müəyyən vaxtlarda bu məsələyə öz əsərlərində geniş yer ayırmışlar. Lakin «dil tipi» məsələsi, ümumiyyətlə, dillərin morfoloji təsnifatı dilçilikdə hələ də öz aktuallığını saxlayır. A.Reformatskinin qeyd etdiyi kimi, E.Sepir bu sahədə xüsusi tədqiqatlar aparsa da, «dil tipi» məsələsi hələ də dilçiliyin tam həll olunmamış problemi kimi qalır [100, 360]. Fransız dilçisi Antuan Meye isə dünya dillərinin daha çox genealoji təsnifatına üstünlük vermiş, morfoloji təsnifatı isə ümumilikdə qəbul etməmişdi. Məhz bunları nəzərə alaraq dillərin morfoloji təsnifatına yenidən baxılması  zəruri olsa da, ənənəvi təsnifatın elmi əhəmiyyətini  heçə endirmək də, fikrimizcə, düzgün olmazdı.

Dil tipləri içərisində iltisaqi dillər öz qrammatik quruluşuna görə digər dillərdən köklü surətdə fərqlənir. Məlumdur ki, iltisaqi dillərin struktur–tipoloji əlamətlərini özündə daha çox ehtiva edən dillər Altay dilləridir. Məhz buna görə də iltisaqi dillərin ümumi qrammatik quruluşunu izah etməyə çalışarkən biz daha çox Altay dillərinin materiallarına əsaslanacağıq.

İltisaqi dillər aqqlütinasiya yolu ilə əmələ gəlir. «İzahlı dilçilik terminləri lüğəti»ndə aqqlütinasiyaya belə tərif verilir: «Aqqlütinasiya-1.Yalnız bir mənası olan standart sözdəyişdirici şəkilçilərin sabit söz kökünə (və ya əsasına) qoşulması. Bu kimi qrammatik xüsusiyyəti olan dillərə aqqlütinativ (iltisaqi) dillər deyilir. Məsələn, *türk dilləri*, *fin-uqor dilləri* və s. Aqqlütinasiya odur ki, hər bir şəkilçi yalnız bir qrammatik məna daşıyır, eləcə də hər bir qrammatik məna bir şəkilçi vasitəsilə ifadə edilir. 2.Adətən yanaşı

gələn iki sözün bir-birinə qovuşaraq bir söz şəklinə düşməsi. Məsələn, *bildir (bir ildir), bilərzik (bilək üzük).*» [2, 8]. Göründüyü kimi, bu tip dillərdə sözlərin cümlə daxilində bütün leksik və qrammatik əlaqələri şəkilçi vasitəsi ilə ifadə olunur.

Dilçilik nəzəriyyəsində «aqqlütinasiya» dedikdə adətən təkcə hər hansı bir sözü əmələ gətirən müxtəlif komponentlərin bir-biri ilə birləşməsi deyil, həm də şəkilçilərin bir çox xüsusiyyətləri, onların monosemantizmi, sözdəyişdirmə və sözyaratma imkanları, ahəng qanunu və s. də nəzərdə tutulur.

Bəzən hər cür şəkilçiləşmə aqqlütinasiya kimi başa düşülür. Eyni zamanda iltisaqi dillərdə şəkilçilərin yalnız təkmənalı, flektiv dillərdə çoxmənalı olması fikri də, bizcə, yanlışdır. Şəkilçilər mənalarının kəmiyyətindən asılı olmayaraq həmişə hansısa bir morfemi təşkil edən komponentlərdən biri olaraq qalırlar. Onlar (şəkilçilər) morfemin digər komponenti olan kök morfemlə sıx əlaqədədirlər və onunla müqayisə edilirlər. Şəkilçilərin mənasının kəmiyyəti (monosemiya və polisemiya) onların birləşməsindən (aqqlütinasiya və fuziya) çox az asılıdır. Birləşmənin üsulu və birləşmiş elementlərin məna xüsusiyyətləri bütün dillərdə müstəqildir. Bunu «Dil» əsərində E. Sepir də qeyd etmişdir. O, dillərin morfoloji tipini müəyyən edib, dilləri tiplərinə görə təsnif edə bilməsə də, «ifadə etmənin texnikası» (izoliyasiya, aqqlütinasiya, fuziya və simvolizasiya) ilə «sintezin dərəcəsini» (analitiklik, polisintetiklik və sintetiklik) bir-birindən fərqləndirmişdir [115, 95-97]. Beləliklə, demək olar ki, «aqqlütinasiya» hər hansı bir sözün morfoloji komponentlərinin birləşməsi üsuludur və həmin birləşmənin digər üsulu olan fuziyaya qarşı qoyulur.

İltisaqi dillərdə yeni söz yaradılmasında və sözün şəklinin dəyişməsində iştirak edən morfemlər (kök və şəkilçi) arasındakı

əlaqə flektiv dillərə nisbətən çox sıx deyildir. Yəni sözlər asanlıqla kök və şəkilçiyə ayrıla bilir. Bu vaxt kök morfem də, şəkilçi morfem də öz müstəqilliyini qoruyub saxlayır. Bu tip dillərin əsas xüsusiyyətlərindən biri də budur ki, şəkilçi kökə qoşularkən kök heç bir dəyişikliyə məruz qalmır. Söz yeni qrammatik forma kəsb etdikcə kök özünün müstəqil formasını saxlayır, şəkilçi morfemlər isə dəyişməyə məruz qalır. Məsələn, Azərb. *şəkil–şəkil-ə,* T. türk. *daγ* «dağ»*–daγ-a* «dağa», monq. *gaǯar* «torpaq, yer»*–gaǯar-a* «torpağa, yerə», tunq.-manc. *lamu* «dəniz»*–lamu-du* «dənizdə» və s. Eyni zamanda kökün söz olması üçün heç bir şəkilçiyə ehtiyac yoxdur. Şəkilçilər həmişə sözdən kənarda olur və sözə bir növ yapışdırılır. İlk baxışdan elə görsənir ki, bu yapışdırılma sanki süni yapışdırılmadır. İstənilən vaxt hər iki tərəfin müstəqil mənası ola bilər.

İltisaqi dillərdə əsasən fonetik şərtlərdən asılı olaraq morfemlər bir sıra dəyişikliyə məruz qalır. Məsələn, iltisaqi dillərdə (xüsusilə Altay dillərində) ahəng qanunu deyilən fonetik hadisə müşahidə olunur. Belə ki, söz daxilində incə sait incə saiti, qalın sait qalın saiti izləyir. Kökə qoşulan şəkilçi morfemlər kökdəki saitlərin qalın və incəliyinə görə bir neçə variantda işlənə bilir. Məsələn, *çiçək-lər, dağ-lar* (Azərbaycan dilində), *kul-lar*-«qollar», *öy-lör*-«evlər» (tatar dilində), *öl-üš* «ölüm» (yeni uyğur dilində), *kör-mök* «görmək» (Altay dilində) və s.

İltisaqi dillərdə hər bir şəkilçi morfemin əksərən bir qrammatik mənası olur, yəni qrammatik məna yalnız bir şəkilçi ilə ifadə olunur. Həm də flektiv dillərdən fərqli olaraq aqqlütinativ dillərdə eyni vaxtda bir şəkilçi bir çox hallarda bir qrammatik mənanı ifadə edir. Müqayisə edək: məsələn, rus dilində *kniqa* sözündəki *-a* sonluğu eyni zamanda həm adlıq halı, həm cins kateqoriyasını, həm təki, *kniqi* sözündəki *-i* sonluğu həm yiyəlik halı, həm cəmi, *v kniqe*

sözündəki *-e* sonluğu həm çıxışlıq halı, həm də təki, *v kniqax* sözündəki *-ax* sonluğu isə həm çıxışlıq halı, həm də cəmi bildirir. İltisaqi dillərdə isə şəkilçilərin hər birinin özünəməxsus vəzifəsi var. Məsələn, Azərbaycan dilində *yolda,* sözündə *-da*, monq. *tengride* «göydə, səmada» sözündə *-de* şəkilçiləri yalnız yerlik halın şəkilçisidir. Onun bu sözün hüdudunda bundan başqa qrammatik mənası yoxdur. Kəmiyyət isə sıfır şəkilçi ilə ifadə olunmuşdur. *Yollarda* sözündə də *-lar* şəkilçisi yalnız cəmin, *-da* isə yalnız yerlik halın şəkilçisidir. Deməli, buradan belə bir nəticəyə gəlmək olar ki, iltisaqi dillərdə hər hansı bir qrammatik mənanı hansısa şəkilçi ifadə edirsə, o, demək olar ki, həmişə həmin şəkilçi ilə də ifadə olunacaqdır (təbii ki, burada istisnalar mövcuddur).

İltisaqi dillərin flektiv dillərdən bir fərqi də ondadır ki, flektiv dillərdə söz daxilində yalnız bir sözdəyişdirici şəkilçi işlənə bilərsə, iltisaqi dillərdə bir neçə qrammatik şəkilçi işlənə bilər, həm də bir söz-forma daxilində həmin şəkilçi bir neçə dəfə təkrarlana bilər. Məsələn, *döy + üş + çü + lər + imiz + dən + dir + lər*. Göründüyü kimi, burada iki sözdüzəldici şəkilçi, iki cəm şəkilçisi və s. işlənmişdir. Lakin bəzi tədqiqatçılar göstərirlər ki, iltisaqi dillərdə bir şəkilçinin bir söz daxilində bir neçə dəfə işlənə bilməsi nadir hallarda baş verir. Məsələn, O. P. Sunik *ev-də-ki-lər-də* sözündəki *-də* şəkilçilərini yerlik halın müxtəlif variantlarının formantları kimi qəbul edir [122, 61].

B.Serebrennikov iltisaqi dillərdə mövcud olan özünəməxsus davamlılığı izah edərkən göstərir ki, «… sözlərin dəyişməsindəki müxtəlif proseslər–sait və samit əvəzlənmələri, söz kökündəki saitlərin, sözün sonundakı samitlərin dəyişməsi, sözün sonunun pozulması hadisəsi iltisaqi dillər üçün də yad deyildir. Əsas fərq ondan ibarətdir ki, bəzi hadisələr (məsələn, ablaut hadisəsi) iltisaqi

dillər üçün tipik deyildir…» [118, 7]. O, ahəng qanununu da davamlılığın əsas şərtlərindən bir kimi qeyd etmişdir [118, 8].

Beləliklə, söylənilənlərdən belə nəticəyə gəlmək olar ki, iltisaqi dillərin söhbət daha çox türk, monqol, tunqus-mancur dillərindən gedir) belə davamlı qrammatik quruluşa malik olması onların qohumluğu barədə fikirlər irəli sürməyə də imkan verir.

**1. 2. Genealoji təsnifat və dil qohumluğunun şərtləri**

XlX əsrdə və XX əsrin əvvəllərində tarixi dilçiliyin əsas uğuru dünyanın ən böyük dil ailəsi olan hind-Avropa dillərinə müqayisəli-tarixi metodun tətbiq edilməsi ilə bağlı olmuşdur.

Genealoji təsnifat dillərin qohumluğuna və qohumluğun dərəcəsinə (bir dil başqa bir dillə az və ya çox dərəcədə qohum ola bilər) əsaslanır.

Dillərin genealoji baxımdan bölgüsü Avropada İntibah dövrünə təsadüf etsə də, buna ilk cəhd hələ XI əsrdə olmuşdur. Dövrünün görkəmli türkoloqu Mahmud Qaşğarlı tanış ola bildiyi bir çox türk dillərindən topladığı külli miqdarda material əsasında 1073-1074-cü illərdə «Divani lüğət-it-türk» adlı əsərini yazmışdır. M.Qaşğarlı bu əsərində bir neçə türk dilini müqayisə etmişdi və onların genealoji cəhətdən qohum olmasına zərrə qədər də şübhə etməmişdi.

Qeyd edək ki, müqayisəli dilçiliyin meydana gəlməsinə qədər müxtəlif dilçilər (Q.Postellus, İ.Skaliger, Y.Kamenski, E.Gişar) bəzi dilləri qohumluğa görə təsnif etməyə çalışsalar da, diqqəti daha çox riyaziyyatçı–filosof Hotfrid-Vilhelm Leybnisin təsnifatı cəlb edir. Maraqlısı budur ki, o, dillərin müqayisəsindən danışarkən nəinki hind-Avropa dillərindən bəhs etmiş, hətta fin və macar dillərinin yaxın qohumluğundan söz açmış, bu dillərin türk, monqol və mancur

dilləri ilə qohum olduğunu qeyd etmişdir. H.Leybnis dünya dillərini qohumluq əlaqələrinə görə iki böyük qrupa ayırmışdır. Onun təsnifatında ikinci qrup özü də iki yarımqrupa bölünür:

I. Arami (sami) dilləri.

II. Yafət dilləri.

1. Skif dilləri (fin, türk, monqol və slavyan).

2. Kelt dilləri (yerdə qalan bütün Avropa dilləri) [ Bax:16, 59].

Göründüyü kimi, bu təsnifatda cüzi dəyişikliklər edilsəydi, H.Leybnisin təsnifatı indiki hind-Avropa və Ural-Altay dil ailələrini təxminən əhatə etmiş olardı.

XIX əsrin əvvəllərində meydana gəlmiş və dilçilik nəzəriyyəsində böyük inqilab hesab edilən müqayisəli-tarixi metod (nəzəri ədəbiyyatda bu metod komparativistika da adlandırılır) dünya dillərinin genealoji bölgüsünə əsaslı elmi zəmin yaratdı. Dillərin tarixi baxımdan öyrənilməsinin xüsusi üsulu olan müqayisəli-tarixi metod ancaq qohum dillər arasındakı münasibətə tətbiq edilir və bu baxımdan müqayisə olunan dillərin materiallarına (xüsusən sözlərə, şəkilçilərə) əsaslanır [139, 8]. Bu metod dilçilik tarixində daha çox Rasmus Rask, Frans Bopp, Yakob Qrimmin adı ilə əlaqələndirilir.

Dünya dilçilik elminin ən nəhəng simalarından sayılan görkəmli alman dilçisi Frans Bopp «Sanskrit dili felinin təsrif sistemi yunan, latın, fars və german dilləri felinin təsrifi ilə müqayisədə» əsərində dilçilik tarixində ilk dəfə olaraq dillərin qohumluğundan söhbət açmış, topladığı zəngin dil faktları ilə sanskrit dilinin Avropa və Asiyada geniş yayılmış bir çox dillərlə qohum olduğunu qeyd etmişdi. F.Bopp tədqiq etdiyi dillərdə fellərin təsrifində morfoloji əlamətləri tutuşdurub, onlar arasındakı oxşarlığı, yaxud eyniliyi göstərmiş və qeyd etmişdir ki, belə bir hal müqayisəyə cəlb olunan

dillərin ümumi bir mənşədən törədiyini təsdiq edir. O, müqayisə üçün dillərin qrammatik quruluşunu əsas götürmüşdü.

F.Boppdan sonra R.Rask «Qədim Şimal dili sahəsində tədqiqat, yaxud island dilinin mənşəyi» əsərində island dili ilə yunan, latın dillərinin qohumluğundan bəhs etmişdir. Daha sonra o, «Fin dili haqqında traktat» əsərində fin-uqor və çuvaş dillərini müqayisəyə cəlb etmiş, onları Qafqaz dilləri və bir sıra dillərlə birlikdə «skif dilləri» adı altında birləşdirmişdir. R.Raskın fikrincə, aqqlütinativ xarakterinə əsasən Asiyanın bir çıra dillərini birləşdirmək olar [Bax: 82, 77].

R.Raskın ardınca Y.Qrimm «Alman qrammatikası» əsərində german dillərinin, A. A.Vostokov slavyan dillərinin qohumluq məsələlərini tədqiq etmişdir.

Dillərin qohumluğundan bəhs edən tədqiqatçılar arasında alman dilçisi A.Şleyxer xüsusi yer tutur. O, tədqiqatlarında hind-Avropa dillərinin törədiyi ulu dili müəyyənləşdirməyə çalışmış və sanskritin hind-Avropa dilləri üçün ilkin (protodil) olması fikrini irəli sürmüşdür.

A.Şleyxer ilk dəfə olaraq hind-Avropa dillərinin genealoji təsnifini vermiş və dillərin şəcərəsi (və yaxud şəcərə ağacı) nəzəriyyəsini işləyib hazırlamışdı. Dillərin şəcərəsi nəzəriyyəsində əsas yeri «ulu dil» anlayışı tutur. A.Şleyxerin fikrincə, ulu dildən törənən digər dillər dil nəslini və ya dil ağacını təşkil edir. Dil nəsli isə öz növbəsində dil ailələrinə, yaxud dil budaqlarına bölünür. A.Şleyxer təklif edirdi ki, ulu dildən ayrılmış ilkin dillər kök dillər adlandırılsın. Kök dillər mərhələli şəkildə dillərə, dialektlərə, yarımdialektlərə, şivələrə bölünür. Nəhayət, zaman keçdikcə dialektlər və yarımdialektlər bir-birindən uzaqlaşaraq müstəqil dillərə çevrilir və yenidən dialektlərə və yarımdialektlərə bölünürlər. Qeyd

etdiyimiz kimi, A.Şleyxer hind-Avropa dillərinin «ulu dili» deyərkən qədim sanskrit dilini nəzərdə tutmuşdur [Bax:16, 100].

A.Şleyxerin ardınca onun şagirdi İ.Şmidt «Hind-german dilləri arasında qohumluq münasibətləri haqqında» (1872) adlı əsərində ilk dəfə olaraq müəllimi A.Şleyxerin şəcərə ağacı nəzəriyyəsinə qarşı çıxmışdır. O göstərmişdir ki, ümumiyyətlə, «hind-Avropa ulu dili» anlayışının özü kökündən səhvdir. İ.Şmidtin fikrincə, ulu dil heç vaxt vahid şəkildə mövcud ola bilməz və o əvvəlcədən dialektlərə bölünmüş halda mövcud olmuşdur. Elə həmin əsərində A.Şleyxerin şəcərə ağacı nəzəriyyəsinə qarşı İ.Şmidt dalğa nəzəriyyəsini irəli sürmüşdür. Dalğa nəzəriyyəsinə görə, coğrafi məkanca bir-birinə yaxın olan dillərdə oxşarlıqlar daha çox müşahidə olunur. Əksinə, bir-birindən təcrid olunduqca, dillər arasındakı oxşarlıq getdikcə zəifləyir.

Sadalamalardan göründüyü kimi, yenə də hind-avropaşünasların tədqiqatlarındakı yarımçıqlıq, birtərəflilik, dünya dilləri dedikdə yalnız hind-Avropa dillərinin nəzərdə tutulması özünü açıqdan-açığa büruzə verir.

Təxminən həmin dövrlərdə şərq dillərinin, xüsusilə də türk dillərinin müqayisəli öyrənilməsində İ.İ.Sreznevski, F.İ.Buslayev və başqaları ilə bərabər, Rusiyada müqayisəli-tarixi metodun görkəmli nümayəndələrindən biri hesab olunan Mirzə Kazımbəyin böyük rolu olmuşdur. O, «Türk-tatar dilinin ümumi qrammatikası» əsərində Azərbaycan dilinin qrammatik quruluşundan bəhs etsə də, başqa türk dillərini və çox maraqlıdır ki, monqol dilini də müqayisəyə cəlb etmişdir [50].

XX əsrin əvvəllərində dillərin qohumluğundan bəhs edən ən sanballı tədqiqatlar Antuan Meyenin adı ilə bağlıdır. Xeyli dil

bilməsi onun komparativistika sahəsində görkəmli mütəxəssis kimi yetişməsində böyük rol oynamışdır.

A.Meye dillərin qohumluğuna əsaslanan genealoji təsnifatı əvəzedilməz, qiymətli elmi təsnifat hesab etmişdir və dillərin morfoloji təsnifatının qəti əleyhinə olmuşdur. O, «Hind-Avropa dillərinin müqayisəli öyrənilməsinə giriş» (1903) adlı əsərində yazırdı: «… iki dil nə vaxtsa istifadədə olan eyni bir dilin iki müxtəlif təkamülünün nəticəsidirsə, o dillər qohum adlandırılır» [76, 73]. Ulu dil və onun bərpa edilməsi məsələsində A.Meyenin fikirləri digər tədqiqatçıların, xüsuilə də A.Şleyxerin və gənc qrammatiklərin fikirlərindən kəskin surətdə fərqlənir. O da komparativistikanın başqa nümayəndələri kimi, bir-biri ilə qohum olan hind-Avropa dillərinin nə vaxtsa mövcud olmuş eyni bir dilin (hind-Avropa ulu dilinin) inkişafı və divergensiyası nəticəsində meydana gəldiyi fikrindədir. Lakin A.Meye iddia edirdi ki, müqayisə yolu ilə həmin ulu dili bərpa etmək mümkün deyildir və göstərirdi ki, müqayisəli qrammatikanın əsas vəzifəsi dillərin tarixini yaratmaqdır. Onun fikrincə, müqayisəli qrammatika ayrı-ayrı dillərin tarixini və qohum dillər arasındakı uyğunluqları tədqiq etməklə məşğul olmalıdır. A.Meye qeyd edirdi ki, hər hansı bir formanı tarixi baxımdan izah etmək üçün onun ən qədim pilləsinə aid əldə kifayət qədər əsas olmalıdır. Bununla da o, özünəqədərki müqayisəli dilçiliyin ən ümdə məsələsi olan hind-Avropa ulu dilinin bərpa edilməsi məsələsinin üstündən xətt çəkmiş olurdu.

Qeyd edək ki, A.Meyenin bu fikri ilə razılaşmamaq mümkündür, çünki, onun göstərdiyi kimi, iki qohum dil nə vaxtsa istifadədə olan eyni bir dilin iki müxtəlif təkamülünün nəticəsidirsə, bu dili tədqiq və bərpa etməyə cəhd göstərməyə dəyər. Ən azından ona görə ki, bununla qohum dillərdəki özünəməxsusluqların

mahiyyətini və səbəbini asanlıqla dərk etmək mümkündür. A.A.Reformatskinin qeyd etdiyi kimi, burada müasir canlı dillərdən və dialektlərdən, qədim yazılı abidələrdən, düzgün bərpaetmənin bütün imkanlarından istifadə etmək və həmin dil faktının daşıyıcısı olan xalqı dərindən öyrənmək lazımdır. Əgər ulu dili bütöv halda, sistem şəklində bərpa etmək mümkün deyildirsə, heç olmasa, onun fonetik və qrammatik quruluşunun, leksikasının, əsas leksik fondunun bərpasına çalışmaq lazımdır [100, 399-400].

Dillərin qohumluğu məsələsindən danışarkən görkəmli dilçi N.Y.Marrın da tədqiqatlarını nəzərdən keçirmək lazımdır.

Əsasən Qafqaz dillərinin tədqiqi ilə məşğul olan N.Y.Marr hind-Avropa dil ailəsinə aid edilən erməni dilində Qafqaz substratının mövcud olmasını müəyyənləşdirmişdir. Bu substratı o, yafəz adlandırmış və onun elementlərini nəinki erməni dilində, bütün dünya dillərində axtarmağa çalışmışdır. Beləliklə, bir vaxtlar elm aləmində qəbul edilib, geniş yayılan «dil haqqında yeni təlimin» və ya Yafəz nəzəriyyəsinin bünövrəsi qoyulmuşdur. N.Y.Marr özünəqədərki ənənəvi dilçiliyi, demək olar ki, rədd etmiş, haqlı olaraq hind-Avropa dilçiliyinin sonda burjua elminə çevrildiyini (yəqin ki, bu cür adlandırma daha çox dövrün tələbinə uyğunlaşdırılmışdır–*T.Q.*) elan edərək orijinal dilçilik konsepsiyası yaratdığını iddia etmişdir.

N.Y.Marr bütün dillərin inkişaf yollarının eyni olduğunu (qlottoqonik proseslərin vahidliyi nəzəriyyəsi) sübut etməyə səy göstərmişdir. O, dünya dillərinin qohum olduğunu göstərmiş və bütün dillərin əsasında dörd elementin **(sal, ber, yon, roş)** dayandığını qeyd etmişdir [75, 100-107].

Bir çox dilçlik ədəbiyyatlarında göstərilir ki, N.Y.Marr A.A.Şleyxerin bioloji nəzəriyyəsini əldə rəhbər tutaraq dillərin

mərhələli (stadial) inkişafı nəzəriyyəsini irəli sürmüşdür. Bu nəzəriyyəyə görə, bütün dillər mərhələli şəkildə inkişaf etmişdir. N.Y.Marr da belə bir səhv nəticəyə gəlmişdir ki, amorf dillər (məs., Çin dili) dünya dillərinin inkişafında ilk və ibtidai mərhələni təşkil edir. Bu inkişafın ən yüksək mərhələsinə isə flektiv dillər daxildir. İltisaqi dillər flektiv dillərdən bir pillə aşağıdadır. İnkorporlaşan dillər isə köksözlü dillərə və ya iltisaqi dillərə aid edilir. Ancaq bizə belə gəlir ki, N.Y.Marrın bu ideyası dili bioloji orqanizm hesab etməsindən daha çox, onu sinfi hadisə adlandırması və dili üstquruma aid etməsi ilə bağlıdır. Çünki N.Y.Marr qeyd edir ki, cəmiyyət bir ictimai formasiyadan digərinə keçdikcə dil də bir vəziyyətdən digər vəziyyətə keçir. Buna görə də dilin strukturu birdən dəyişir və çoxlu köhnə elementləri özündə saxlamaqla yeni və keyfiyyətcə əla dil sistemi yaranır. Məsələn, izolə edilmiş dillər cəmiyyətin ilk, flektiv dillər isə klassik formasiyasının dil xüsuiyyətlərini əks etdirir [75, 107].

Əlbəttə, dilçilik üçün xeyli müsbət işlər görmüş N.Y.Marrın bu nəzəriyyəsi dil tipologiyasının statikliyinin əksinə yönəldiyindən haqlı olaraq kəskin tənqid edilmişdir, çünki bu nəzəriyyə dillərin hər hansı bir qrupdakı yerini daha da möhkəmlədir, onların öz strukturunu dəyişməsini, bir tipoloji formadan digərinə keçə bilməsini qətiyyətlə rədd edirdi.

Qeyd edək ki, müqayisəli-tarix metodun dillərə tətbiqi heç də yüksələn xətt üzrə inkişaf etməmişdir. Müəyyən dövrlərdə dillərin qohumluğu məsələsinə müxtəlif münasibətlər mövcud olmuşdur. Məsələn, H.Şuxardt və B. de Kurtene öz tədqiqatlarında dillərin qohumluğu nəzəriyyəsinə böyük skepsislə yanaşmışlar. Onlar qohumluğa bu cür baxışları ilə demək olar ki, qarışıq dillərin öyrənilməsinin əsasını qoymuşlar.

Hələ roman dillərinin dialektlərini öyrənərkən H.Şuxardt belə bir nəticəyə gəlmişdi ki, dialektlər arasında dəqiq sərhəd mövcud deyildir. Hər bir dil hadisəsinin öz yayılma yeri vardır və həm də müxtəlif hadisələrin baş verdiyi yerlər üst-üstə düşməyərək bir-biri ilə kəsişir. H.Şuxardta görə, bu hadisələrin əsas səbəbi dialektlərin daimi qarşılıqlı əlaqələridir [141,141-146].

Eyni fikri Boduen de Kurtene də söyləmişdir. Tədqiqatçı 1904 -cü ildə nəşr etdirdiyi «Dilçilik» adlı məqaləsində qeyd etmişdir ki, dil hadisələrinin və xüsusiyyətlərinin hüdudunu göstərmək qeyri-mümkündür. Məsələn, o, roman dilləri ilə slavyan dilləri ararsında dəqiq sərhədi tapmaq mümkün olmadığını göstərmişdir [31, 111].

Beləliklə, dilçilikdə ilk dəfə H.Şuxardt və B.de Kurtene bütün dillərin qarışıq xarakterli olması nəticəsinə gəlmişlər. Qarışıq dillər isə müxtəlif dil ailələri ilə qohum ola bilərlər və çətinliklə təsnif olunurlar. H.Şuxardt qeyd edir ki, bəzi dillər iki dil ailəsi arasında ortaq mövqedə dayanır [141, 145-146]. Boduen de Kurtene belə dillərə misal olaraq ingilis dilini göstərir. İngilis dili german dilləri ailəsinə daxil olsa da, bir çox xüsusiyyətlərinə görə onu roman dilləri ailəsinə də aid etmək olar. Erməni dili hind-Avropa dil ailəsinə daxil edilsə də, onu bir neçə dil ailəsinə daxil etmək mümkündür.

H.Şuxardt və B. de Kurtene sistemli şəkildə A. Şleyxerin şəcərə ağacı konsepsiyasına qarşı çıxmışlar. Daha sonra H.Şuxardt İ.Şmidtlə birlikdə məlum dalğa nəzəriyyəsini təklif etmişdir. B. de Kurtene isə onların bu nəzəriyyəsini də təkzib etmişdir.

Nəzəri dilçilik üçün maraqlı fakilardan biri də budur ki, H.Şuxardt da, B. de Kurtene də dillərin qohumluğunun iki formasını göstərmişlər: genealoji qohumluq və tarixi qohumluq. Lakin sonralar Boduen de Kurtene qohumluğun üçüncü tipini də qeyd etmişdir. Bu qohumluq daha çox ümumi coğrafi yaxınlığa əsaslanır. Elə bu fikirlə

o, konvergensiya hadisəsini diqqət mərkəzinə çəkmiş və dillərin qohumluğunun üçüncü tipini–coğrafi cəhətdən yaxın olan dillərin qohumluğunu əsaslandırmışdı.

Beləliklə, H.Şuxardtın və B. de Kurtenenin tədqiqatları nəticəsində dillərin konvergensiyası, ləng də olsa, tədqiqat obyektinə çevrildi və sonralar bir sıra dilçilərin (məsələn, dünya dillərini [nostratik dillər adı altında] bütövlükdə müqayisəyə cəlb edən V. M. İllıç-Svitıçın) tədqiqatlarına güclü təsir göstərdi.

Ümumiyyətlə, müqayisəli-tarixi metoda dünya dillərinin qohumluğunu sübuta yetirən ideal bir metod kimi yanaşmaq düzgün olmazdı. Əvvəla, ona görə ki, metod yarandığı gündən yalnız hind-Avropa dillərinin qohumluğunu sübuta yetirməyə xidmət etmişdir. Bu ən azı ondan görünür ki, müqayisəli-tarixi metodun inkişafının ən yüksək dövrlərində onun tədqiqat obyektini yalnız flektiv quruluşu olan dillər təşkil etmişdir. Burada digər tiplərə aid olan dillər (xüsusilə yayılma arealına görə flektiv dillərdən sonrakı yeri tutan iltisaqi dillər) ya ümumiyyətlə nəzərə alınmamış, ya da nəzərə çarpmayacaq dərəcədə epizodik mövqedə qalmışdır. Hind-avropaşünasların gəldiyi absurd qənaətə görə, «nizamlı qrammatik quruluşu olan dillər (türk dilləri) anomaliyalarla izlənən hind-Avropa dillərinə nisbətən müqayisəyə çox çətin cəlb olunurlar və bu dillərin hansı dillərlə qohum olduğunu müəyyən etmək o qədər də asan deyildir» [52, 34]. Məhz buna görə də müqayisəli-tarixi metod, belə demək mümkündürsə, flektiv (xüsusən hind-Avropa) dillərin qrammatik quruluşuna köklənmiş bir metoda çevrilmişdir və təbii ki, digər quruluşlu dillərə tətbiq olunan zaman əks nəticələr qeydə alınmalıdır.

Bu məsələdə hind-Avropa dillərinin müqayisəli öyrənilməsi ilə məşğul olan tədqiqatçıların birtərəfli mövqeyini də nəzərə almaq

vacibdir. Hind-Avropa dillərinin qohumluq prinsiplərini diqqətlə müşahidə edərkən görünür ki, komparativistlər daha çox bu dillərdə bir-birinə uyğun gələn faktları seçərək, onları ümumilikdə bütün dünya dilləri üçün (quruluşundan asılı olmayaraq) qohumluğun meyarları elan etmişlər. Yəni hind-avropaşünaslar «… saysız-hesabsız dünya dilləri içindən hind-Avropa dil qrupunu seçib ayırdılar. Bura bütün Avropa (macar və fin dillərini çıxmaq şərtilə) İran və hind dilləri daxil edildi. Bu nəhəng dil ailəsi aşağıdakı kobud sxem üzrə yaradılırdı: latın və yunan qrammatikasının bəzi elementləri sanskrit dilindəkilərə uyğun gəlir, kelt və qot dili qrammatikasında oxşarlıqlar var, latın qrammatikası ilə slavyan qrammatikası arasında yaxınlıq mövcuddur və s. və ilaxır» [17: 180]. Bu bəsit sxem hələ də hind-avrorpaşünaslağın nüvəsini təşkil edir.

Müqayisəli-tarixi metodun banilərinin əksinə olaraq (F.Bopp, R. Rask dillərin qohum olmasını sübut etmək üçün leksik səviyyəni tutarlı mənbə hesab etməmişlər) sonrakı komparativistlər dillərin leksikasına da nüfuz etməyə çalışmışlar. Lakin burada da hind-Avropa dillərinin qohumluğunu söyləməyə imkan verən faktlar seçilmişdir:

«1. Üçdən beşədək (beşlik sistemi mövcud olanda) yaxud üçdən doqquzadək (onluq sistemi mövcud olduğu dövrlərdə) olan saylar. «Bir» sayı az dayanıqlıdır. Nə üçün? Çünki hind-Avropa dillərində «bir» sayının adları müxtəlifdir.

2. I və II şəxs əvəzlikləri. Nə üçün yalnız I və II şəxs əvəzlikləri? Çünki hind-Avropa dillərində III şəxs əvəzlikləri bir-birinə uyğun gəlmir.

3. Bəzi qohumluq terminləri.

4. Bir sıra bədən üzvlərinin adları (hind-Avropa dillərində yalnız ayaq sözü ümumidir)» [17,181].

Bu fikrə bir şeyi də əlavə edək ki, komparativistlər digər dil ailələri ilə bağlı məsələlərdə substart, superstrat faktını həddindən artıq qabartsalar da, hind-Avropa dilləri üçün bu amilləri həmişə arxa plana keçirmişlər. Məsələn, O. Süleymenovun haqlı olaraq qeyd etdiyi kimi, «…bəlkə say, əvəzlik və qohumluq terminləri heç də əcdad hind-Avropa dillərinin qalığı deyil, sadəcə olaraq hansısa dildən (deyək ki, fars dilindən) onun ən geniş yayıldığı dövrdə (deyək ki, e. ə. I minillikdə Əhəmənilər zamanında, fars hakimiyyətinin qərbdə Yunanıstan və Misirə, şərqdə Hindistan və Çinədək yayıldığı bir dövrdə) mənimsənilib?» [17, 182].

Məlumdur ki, müqayisəli-tarixi metodun qarşısında duran əsas məsələlərdən biri də ulu dilin bərpa olunmasıdır. Lakin bu məsələdə də komparativistlər yekdil nəticəyə gələ bilməmişlər. İlk dövrlərdə F.Bopp hind-Avropa dillərinin sanskritdən, yaxud onunla ümumi olan bir «atadan» törəməsi fikrini irəli sürsə də, sonradan bu dillər arasında «qardaşlıq» münasibəti olduğu qənaətinə gəlmişdir. F.Şlegel sanskrit dilinin ilkin olması və bütün hind-Avropa dillərinin ondan törəməsi fikrini qətiyyətlə müdafiə etmişdir. A.Şleyxer sanskrit dilinin ümumi qrammatik quruluşuna əsaslanıb, ulu hind-Avropa dilini bərpa etməyə səy göstərmişdir. Lakin XX əsrin I yarısının ən böyük komparativisti olan A.Meye özünəqədərki müqayisəli dilçiliyin əsas məsələsi olan hind-Avropa ulu dilinin bərpası problemini ümumilikdə rədd etmişdir. N.S.Trubetskoy ulu dilin reallığına inanmırdı. Daha sonralar alman alimi Ziqmund Feyst belə bir nəticəyə gəlmişdir ki, almanlar hind-avropalılaşdırılmış fin-uqorlardır. Holland tədqiqatçısı Ulenbek sübut etmişdir ki, hind-Avropa dilləri iki dil ailəsinin birləşməsindən meydana gəlmişdir. Onlardan biri Ural-Altay ailəsinə, digəri isə Qafqaz dillərinə yaxındır. Daha orijinal etnoqrafik və antropoloji nəzəriyyə isə

Koppersə aiddir. Onun nəzəriyyəsinə görə, hind-Avropa ailəsi əkinçi və maldar qafqaztiplilərin köçəri Ural-Altay mənşəlilər tərəfindən istila olunması nəticəsində yaranmışdır [36, 32-33].

1915–1917-ci illərdən sonra hind-avropaşünaslar ulu dil probleminə yenidən qayıtmalı oldular. Buna səbəb isə həmin illərdə çex alimi B. Qroznının hett mixi yazısının şifrəsini açması olmuşdur. Əvvəllər sanskriti ulu hind-Avropa dili hesab edən və yaxud ulu hind-Avropa dilinin bərpa olunmasında sanskrit, qədim yunan və latın dillərinə üstünlük verən komparativistlər bundan sonra hett dilini tədqiqat obyektinə çevirdilər. Fikrimizcə, burada iki əsas məqsəd güdülmüşdür: 1) hett dili vasitəsilə ulu hind-Avropa dilinin yaşını bir az da əvvələ aid etmək mümkün idi. Çünki məlum olmuşdur ki, ulu hind-Avropa dilinin parçalandığı dövr hesab edilən e.ə. II minilliyin əvvəllərində hett dili və qədim yunan dilinin dialektlərindən biri müstəqil şəkildə mövcud olmuşdur; 2) hett dilində başqa qədim hind-Avropa dillərinə nisbətən daha arxaik formalar mühafizə olunmuşdur. Şumer dili də təxminən bu baxımdan avropalılar tərəfindən tədqiqata cəlb edilmişdir. Halbuki, Eber-Şrader, Fr. Hommel şumer-akkad dilinin aqqlütinativ tipinə, leksik fonduna, fonetik dəyişmələrin bənzərliyinə əsaslanaraq bu qədim dili Ural-Altay ailəsinə aid etmişlər [4, 16]. Bundan başqa, hett və şumer dilinin türk dilləri ilə yaxın təmasına dair tədqiqatlar getdikcə genişlənməkdədir [17, 191–218; 8, 25–34; 13, 5–24; 12, 128–136; 9, 57–149; 7, 126–138]. Hamilton universitetinin «Hüquq tarixi» əsərinin müəllifləri isə hesab edirlər ki, «Babilin ən qədim sakinləri olmuş şümərlər qeyri-sami və moğol qövmi qollarının birindən olmuşlar» [Bax: 7, 139].

Bütün göstərilən cəhdlərə baxmayaraq müasir dövrümüzədək hind-avropaşünaslar ulu hind-Avropa dilinin dəqiq yaşını, yarandığı

və yayıldığı ərazini, parçalanma dövrü, quruluşu haqqında tam, dəqiq təsəvvür yarada bilməmişlər. Yalnız ayrı-ayrı formaların təxmini rekonstruksiyaları mövcuddur. Halbuki qeyri hind-Avropa dillərinin (məsələn, Altay dillərinin) ulu dilindən söhbət gedərkən komparativistlər tarixdə belə bir dilin mövcud olmaması (guya tarixdə mükəmməl ulu hind-Avropa dili deyilən bir dil mövcud olub, əslində ulu dil təxmini bərpadan başqa bir şey deyildir!) fikrini xüsusi vurğulayırlar.

Söylənənlərdən belə bir nəticəyə gəlmək olar ki, müqayisəli-tarixi metodun bütün dünya dillərinə tətbiq olunaraq onların genetik qohumluğunu sübut etməyə imkan verdiyini söyləmək çox çətindir. Bu metod hind-Avropa dillərindən başqa digər dillərin qohumluğunu sübut etmək üçün kifayət qədər yararlı deyildir. Bizcə, belə vəziyyətdən çıxış yollarından biri də dilləri müqayisə olunan xalqların etno-kulturoloji dünyagörüşündəki uyğunluqları sistemli şəkildə, diqqətlə izləməkdir, çünki hər bir xalqın mənəvi ruhu onun dili ilə yanaşı, mifologiyasında, folklorunda, şifahi yaradıcılıq ənənəsində, etnoqrafiyasında, məişətində yaşayır. Dillərin qohumluğu xalqlarn qohumluğu kimi ciddi bir məsələni gündəmə gətirdiyindən müqayisəli-tarixi metod adı çəkilən sahələrin əldə etdiyi nəticələrə vaxtaşırı müraciət etməlidir.

Qohumluq problemindən danışarkən dillərin iki tarixi əlaqəsini də nəzərdən qaçırmaq olmaz. Bunlardan biri mənşəyindən asılı olmayaraq daha çox ərazi yaxınlığı və sıx mədəni əlaqələr nəticəsində dillərin yaxınlaşması və ümumi cəhətlər əldə etməsi, yəni konvergensiya və ya dillərin inteqrasiyası prosesi, digəri isə bir dilin dialektlərə, yarımdialektlərə, şivələrə bölünməsi və onların sonradan inkişaf edərək qohum dillər yaratmasına əsaslanan divergensiya və ya dillərin differensiasiyası prosesi. Bir çox dilçilik ədəbiyyatında bu

iki prosesin daim bir-birini izləməsini və əvəz etməsini göstərirlər. Lakin qeyd etmək lazımdır ki, yarandığı gündən indiyədək dillərin genealoji təsnifi və müqayisəli-tarixi metod daha çox divergensiya hadisəsinə əsaslanmışdır. Bilavasitə bunun da nəticəsində sinxron dilçilik diaxron dilçiliyi üstələmişdir. Buna görə də ayrı-ayrı vaxtlarda bəzi dilçilər qohumluqdan və təsnifatdan imtina etməsələr də, dillərin genetik qohumluğuna skeptik yanaşmışlar və hətta ondan tamamilə imtina etməyi də təklif etmişdilər.

Qeyd etmək lazımdır ki, dillərin qohumluğunu müəyyənləşdirərkən həmin dillərdə mövcud olan substratlara (iki dilin çarpazlaşması nəticəsində məğlub dilin qalib dildə izlənən ünsürləri) və superstratlara (çarpazlaşma zamanı gəlmə xalqın yerli xalqın dilinə keçən dil ünsürləri) da xüsusi diqqət yetirmək lazımdır.

Dillərin qohumluğunu tədqiq etmək üçün onların fonem sistemi, lüğət tərkibi, sintaksisi və morfologiyası arasındakı əsas oxşar cəhətlər müəyyənləşdirilməlidir. İlk baxışdan bir-birinə oxşayan bəzi zahiri əlamətlərə görə hansısa dilləri qohum hesab etmək olmaz. O dillər qohum hesab oluna bilər ki, vaxtilə mövcud olmuş bir dildən (ulu dildən) törəsinlər, ümumilik təşkil edən qədim kök və şəkilçiləri özlərində ehtiva etsinlər, daimi fonetik uyğunluqları olsun. Çünki əgər material yaxınlığı özünü bir neçə sözdə və ya kökdə, yaxud da iki dildə mövcud olan bir-iki şəkilçidə göstərərsə, bu, qohumluq üçün hələ azdır. Bu yaxınlıq təsadüf də hesab edilə bilər. Məsələn, Azərbaycan dilində ərəb və fars mənşəli sözlərin, rus dilinə məxsus şəkilçilərin işlənməsi heç də bu dillərin qohum olması demək deyildir.

Hələ XİX əsrin birinci rübündə R.Rask dillərin qohumluğunu sübut etmək üçün metod təklif etmişdi. O, dillərin qohumluğunu müəyyənləşdirmək üçün lüğət tərkibinin uyğunluğunu əsas hesab

etmirdi və qeyd edirdi ki, tarixi inkişaf dövründə qarşılıqlı münasibətlərdən asılı olaraq bir dildən digər dilə saysız-hesabsız söz keçə bilər. R.Raskın fikrincə, dillərin qohumluğu üçün əsas meyar qrammatik quruluşun uyğunluğu ola bilər. Dilçi göstərirdi ki, danimarkalıların dilindən qrenland dilinə, portuqal və ispan dillərindən isə malay dilinə külli miqdarda söz keçsə də, bu dillərin qohumluğundan söz gedə bilməz. R.Rask yazırdı: «Qrammatik uyğunluq qohumluğun, yaxud mənşə ümumiliyinin ən mötəbər əlamətidir, çünki məlumdur ki, başqa bir dil ilə qarışan dil həmin dildən hal və təsriflənmə formalarını fövqəladə hallarda qəbul edir, yaxud, daha doğrusu, qəbul etmir, əksinə, öz xüsusi formalarını da itirir» [16, 81]. Dediklərini sübut etmək üçün R. Rask ingilis, dat və ispan dillərini nümunə göstərirdi: ingilis dili skandinav və fransız dillərindən hal və təsriflənmə formalarını almamış, əksinə, özünün qədim anqlosakson fleksiyasının çoxunu itirmişdir; dat dili alman şəkilçilərini, ispan dili isə qot və ərəb şəkilçilərini almamışdır [16, 81].

R.Rask daha sonra qeyd edir ki, dillərin qohumluğu üçün digər əsas lüğət tərkibinin eyniliyi və səs keçmələrinin, çevrilmələrinin (R.Rask sonralar german dillərində samitlərin ilkin çevrilməsi haqqında müqayisəli-tarixi dilçilikdə əhəmiyyətli rol oynayan Rask-Qrimm qanununu kəşf etmişdi) ümumi qanunauyğunluğu ola bilər.

Slavyan və ümumi dilçilik üzrə görkəmli mütəxəssis İ.V. Boduen de Kurtene 1904-cü ildə yazdığı «Dilçilik» adlı əsərində qeyd edirdi ki, milli dillərin müqayisəli xarakteri və təsnifi onların oxşarlığının və fərqliliyinin dəqiq təyin olunmasına əsaslanmalıdır. Dillər arasında oxşarlıq özünü iki formada göstərə bilər: 1) xalqların genealoji və ya tarixi qohumluğunun dilə münasibətinə əsalanan

oxşarlıq (genealoji təsnifat); 2) tarixi və ya genealoji əlaqədən asılı olmayaraq vəziyyətin və dəyişmələrin ümumi oxşarlığı (morfoloji və yaxud struktur təsnifat). Boduen de Kurtene göstərir ki, dillərin genealoji və ya tarixi qohumluğu və onlarda olan oxşarlıq yalnız o dillər arasında ola bilər ki, bu dillər nə vaxtsa mövcud olmuş vahid bir dilin müxtəlif şəkildəyişmələri olsun. Məsələn, slavyan dilləri öz aralarında qohumdurlar və bir-birilərinə oxşayırlar, çünki onlar hamısı bir vaxtlar mövcud olmuş ilkin slavyan və ya ulu slavyan dilinin müxtəlif şəkildəyişməsi, yaxud başqalaşmasıdır [31, 110].

Qohumluğa görə dillər böyük və kiçik dil qruplarında birləşdirilir. Məsələn, hind–Avropa dil qrupu və onun tərkibinə daxil olan slavyan, german, roman və s. dil qrupları. Qeyd edək ki, böyük dil qrupuna daxil olan müxtəlif dillər arasındakı qohumluq ayrıca götürülmüş iki kiçik dil qrupu və ya bir dil qrupuna daxil olan dillər arasındakı qohumluqdan adətən zəif olur. Məsələn, slavyan, german və yaxud roman dil qruplarına daxil olan dillər arasındakı qohumluq hər üç qrupun bir-biri ilə qohumluğundan daha yaxındır. Yəni rus, polyak, sloven dillərinin qrammatik quruluşunuda və əsas lüğət fondundakı ümumilik, rus və roman dil qrupuna aid olan fransız dili arasındakı ümumilikdən çox olacaqdır.

Müqayisəli-tarixi metodun prinsiplərinə görə, dillərin qohumluğunu sübuta yetirmək üçün maddi yaxınlığı olan sözlərin etimologiyasına, dillərdəki leksik uyğunluğa, kök və şəkilçi morfemlərin uyğunluğuna, qrammatik struktur uyğunluğuna, fonetik uyğunluğa, tez-tez izlənilən fonetik qanunlara əsaslanmaq lazımdır.

Dillərin qrammatik quruluşu və əsas lüğət fondu onun əsasını, spesifikasının mahiyyətini təşkil etdiyindən dillərin qohumluğunu müəyyənləşdirərkən bu iki mühüm amilə xüsusilə diqqət yetirmək lazımdır, çünki bir dilin əsasını nə təşkil edirsə, o,

həmin dilə qohum olan dilin də əsasını (özünəməxsus xüysuiyyətləri olsa da) təşkil edəcəkdir. Əgər öyrənilən dillərin qrammatik quruluşunda və əsas lüğət fondunda ümumiliklər meydana çıxarsa, onda həmin dillər qohum dillər hesab edilməlidirlər.

Qohum dillərin əsas lüğət fondundakı əlaqələri öyrənmək nəzəri və praktik əhəmiyyətə malikdir. Öz aralarında vasitəsiz qohumluqla bağlı olan dillərin bütün qrupları üçün bir çox sözlər ümumi olacaq, başqa sözlər isə bu dillərin ayrı-ayrı yarımqruplarını xarakterizə edəcəkdir.

Genealoji metodla tədqiqat apararkən tədqiqata cəlb olunmuş bir sıra dillərdə mövcud olan maddi yaxınlıq əsas diqqət mərkəzində olmalıdır.

Dilçilik tədqiqatlarına əsaslanaraq dillərin qohumluğunun əsas meyarlarını əsasən aşağıdakı qruplaşdırmaq olar:

1) dillərin fonetik strukturunda uyğunluqlar olmalıdır;

2) dillər arasında qanunauyğun səs keçidi mövcud olmalıdır;

3) dillər uyğun qrammatik quruluşa malik olmalıdırlar;

4) ismin hal, felin zaman və şəxs formaları eyni formantların (şəkilçilərin və sonluqların) köməyi ilə yaranmalıdır;

5) lüğət fondunda ümumi sözlər mövcud olmaldır. Burada qohumluq terminləri, bədən üzvlərinin, ev heyvanlarının, rənglərin adları, saylar və s. xüsusilə nəzərə alınmalıdır.

Dünya dillərinin genealoji bölgüsü morfoloji bölgüyə nisbətən daha geniş yayılmışdır. Bunun da başlıca səbəbi bu metodla dilçilik üçün nisbətən daha dəqiq elmi nəticələrin əldə edilməsi faktıdır.

Tədqiqata cəlb etdiyimiz Altay dilləri hind-Aropa dillərindən sonra dünyada ən böyük dil ailəsidir. Müqaiyəsli-tarixi metodun tətbiqində bir sıra çatışmazlıqlar olmasına baxmayaraq, hind-Avropa

dillərinin qohumluğunu sübut edən bütün meyarlar (əlbəttə, qrammatik quruluşun spesifikliyi nəzərə alınmaqla) Altay dillərinin də qohum olmasını söyləməyə imkan verir. Biz həmin meyarlara keçməmişdən öncə, ümumiyyətlə, altayşünaslıq nəzəriyyəsinin dilçilik tarixində tutduğu mövqeyə, altayşünasların gəldiyi elmi nəticələrə nəzər salmağı, Altay dillərinin qohumluğunu inkar edən mövcud baxışları təhlil etməyi lazım bilirik. Bu barədə II fəsildə daha ətraflı danışacağıq.

## II FƏSİL

## ALTAYŞÜNASLIQ NƏZƏRİYYƏSİ MÜQAYİSƏLİ-TARİXİ DİLÇİLİYİN BİR QOLU KİMİ

Altay nəzəriyyəsi müqayisəli-tarixi dilçilikdən yaranmış müstəqil bir nəzəriyyədir. Onun öyrənilməsinin əsas əhəmiyyəti ilk növbədə ondan ibarətdir ki, bu nəzəriyyə xeyli sayda (əllidən artıq) dili özündə birləşdirir. Digər tərəfdən, altayşünaslığın inkişafı dilçilik elminin, xüsusilə də müqayisəli-tarixi dilçiliyin əldə etdiyi nailiyyətlərlə sıx bağlıdır. Məhz müqayisəli-tarixi dilçiliyin metodları (baxmayaraq ki, bunlar daha çox hind-Avropa dillərinə şamil olunmuşdur) Altay dillərinə tətbiq edildikdən sonra müasir altayşünaslıq yüksək elmi inkişaf dövrünə qədəm qoymuşdur.

Qeyd edək ki, XIX əsrin birinci yarısına qədər, yəni müqayisəli-tarixi dilçilik yaranmamışdan əvvəl də Altay dilləri, onlar arasındakı əlaqə müxtəlif tədqiqatçılar tərəfindən tədqiq edilmişdir. Lakin bu tədqiqatlar elmilikdən daha çox tarixi marağa əsaslanırdı. Həmin dövrlərdə (XVII və XVIII əsrlər) nəinki Altay dillərinə, demək olar ki, hind-avropa dillərindən başqa bütün dillərə münasibət tarixi maraqdan yaranırdı.

Altay dillərinə belə bir maraq XVII əsrdən başlamışdır. Artıq bu dövrdə Avropa dillərində türk (İ.Meqizer), monqol (M.Teveno) və

mancur (P.Verbi, M.Teveno) dillərinin qrammatikalarına aid cüzi də olsa tədqiqlər çap olunmuşdu. Bundan sonra holland tədqiqatçısı Nikolas Vitsen «Şimali və şərqi Tartariya» əsərində yakut, tatar, even, buryat, kalmık və Rusiyanın bir sıra fin-uqor və paleoasiya dilləri haqqında məlumat vermişdir [Bax:83, 92].

Rusiyada mövcud olan dillər, xüsusilə Altay dilləri haqqında o dövr üçün daha geniş məlumatı H.Leybnis vermişdir. H.Leybnis həmin vaxtlarda çox məşhur olan dünya dillərinin qədim yəhudi dilindən törəməsi nəzəriyyəsinə qarşı çıxaraq belə bir haqlı fikir irəli sürmüşdür ki, dillər arasında ehtimal olunan qohumluq əlaqəsini izah etmək üçün bir çox dillərdə ciddi etimoloji axtarışlar aparmaq lazımdır. O, bu işdə dialektlərin xüsusi rolunun olduğunu da vurğulamışdır. H.Leybnis Rusiyada geniş yayılmış dillərlə yaxından tanış olmuş və onları təsnif etməyə cəhd göstərmişdir. O yazırdı: «… mən hələ ki Skifiyada çox geniş yayılmış üç dil tanıyıram: 1) rusların, polyakların, slovakların və boqemlərin danışdığı sarmat dili; 2) türklərin, kalmıkların və monqolların danışdığı tatar dili; 3) lapondların, finlənn və macarların danışdığı fin dili». H.Leybnis bunun ardınca qeyd edirdi ki, «samoyed, sibiryak, mordva, çərkəz və çeremis dillərini hansı qrupa aid edəcəyimi bilmirəm» [Bax: 83, 92]. Göründüyü kimi, H.Leybnisin Altay dillərinə verdiyi təsnifat kifayət qədər dəqiq olmasa da, altayşünaslığın inkişafına ehtimal ki, böyük təkan vermişdir.

Artıq XIX əsrin ortalarından başlayaraq Altay dillərinin (daha geniş mənada Ural-Altay dillərinin) qohumluğu məsələsi ön plana çəkilmişdir. Buna əsas səbəb isə müqayisəli-tarixi metodun Altay dillərinə daha geniş tətbiq edilməsi və dəqiq elmi faktların əldə edilməsi idi. Məsələyə ilk dəfə bu yönümdə yanaşanlardan biri eston tədqiqatçısı, akademik F.Videman olmuşdur. O, çud (fin-uqor

qrupu), tatar, mancur və monqol dillərinin qrammatik quruluşunu müqayisə edərək bu dillər arasında qədim və dərin qohumluq münasibətlərinin olduğunu göstərmişdir. F.Videman fin-uqor və Altay dilləri üçün ümumi olan on beş əsas xüsusiyyətin mövcudluğunu qeyd etmişdir. Bunlara saitlərin ahəngi, qrammatik cinsin yoxluğu, şəkilçilərin və köməkçi sözlərin postpozisiyası, hallanmanın və təsriflənmənin eyniliyi və s. daxildir [Bax: 82, 80].

F.Videmandan başqa Q.Çelqrenin və F.Rirexin fin-uqor, türk, monqol və tunqus-mancur dillərinin qohumluğuna həsr olunmuş əsərləri də əhəmiyyətlidir. Lakin bütün bu tədqiqatlara baxmayaraq, XIX əsrin yarısına qədər altayşünaslıq sahəsində əsaslı struktur-tipoloji tədqiqatların sayı çox az olmuşdur.

Yalnız tanınmış alman şərqşünası Vilhelm Şottun tədqiqatlarından sonra altayşünaslıqda nəzərə çarpacaq dərəcədə inkişaf başlamışdır. O, ilk dəfə olaraq illərdən bəri toplanmış zəngin dil faktları əsasında struktur-tipoloji tutuşdurmalar aparmış, müqayisəli-tarixi metodun tətbiqi nəticəsində uğurlu nəticələr əldə etmişdir. V.Şott ömrünün əlli ilini Ural-Altay dillərinin tədqiqinə həsr etmişdir. Onun bu sahəyə həsr olunmuş ilk böyük əsəri «Tatar dilinin tədqiqinə dair təcrübələr» adlı əsəridir. V.Şott bu əsərində türk, monqol, tunqus-mancur dillərinin qrammatik quruluşuna və onların qohumluğunu sübut edən əsas dəlillərə daha geniş yer vermişdir. Onun fikrincə, iki dilin qohumluğundan danışarkən ilk növbədə həmin dillərdəki söz köklərinin və qrammatik formaların müqayisəsinə diqqət yetirmək lazımdır. V.Şott J.Abel-Remyüzlə razılaşmayaraq yazırdı ki, qohum dillərdə bəzi qohumluq terminləri, bədən üzvlərinin adları, təbiət hadisələri, qida məhsullarının adları kimi əsas mənaları ifadə edən sözlərin üst-üstə düşməməsi həmin dillər arasında qohumluğun olmamasından xəbər vermir. Bu mənalar

başqa sözlərlə də istifadə oluna bilər. Bu məqsədlə V.Şott hind-Avropa və sami dillərindəki *«oğul», «qız», «bacı», «arvad», «göy, səma», «torpaq», «günəş», «baş», «daş», «ağac»* sözlərini müqayisə etmişdir [Bax: 82, 81].

«Tatar dilinin tədqiqinə aid təcrübələr» əsərində V.Şott Altay dillərinin saitlər sistemi, ahəng qanunu, saitlərin ayrıca xüsusiyyətləri haqqında müfəssəl məlumat vermişdir. O, eyni za-manda samit səslərdən, onların əvəzlənmələrindən (məs., monq. *n- j-(∅); k ~q; s, z ~t/d ~k* və s.) ayrıca bəhs etmişdir [Bax: 82, 82].

V.Şott fin-uqor dillərinin qrammatik quruluşunu mükəmməl öyrəndikdən sonra bu dillər hesabına Altay dil ailəsinin hüdudlarını genişləndirmək ideyasını irəli sürmüşdür. Onun bu fikirləri «Altay, yaxud fin-tatar dil ailəsi haqqında» adlı əsərində çap olunmuşdur. «Altay dilləri ailəsi», «Altay dilləri» termini də ilk dəfə burada geniş işlənmişdir. Tədqiqat işində əsas diqqət fin-uqor dilləri ilə türk, monqol və tunqus-mancur dillərinin qrammatik quruluşunun müqayisəsinə yönəlmişdir. V.Şott apardığı tədqiqatlara əsaslanaraq Altay dilləri arasındakı qohumluğun xalqların qarşılıqlı əlaqəsinin nəticəsi olması fikrinə etiraz etmişdir. O, həmin dillərin müxtəlif səviyyələrini müqayisə edərək bu fikri qətiyyətlə müdafiə edib genişləndirmişdir [Bax: 82, 82-83].

Altayşünaslığın inkişafında fin tədqiqatçısı M.A.Kastrenin də böyük rolu olmuşdur. 1842-1844 və 1845-1849-cu illərdə Sibirə etdiyi səyahətlər zamanı o, fin-uqor, samodi, türk, monqol, tunqus və paleoasiya dilləri ilə bağlı zəngin materiallar toplamışdır. M.Kastren Altay ərazisini finlərin qədim vətəni hesab edərək göstərir ki, fin dilləri az və ya çox dərəcədə Altayda yaşayan bütün xalqların dilləri ilə qohumdur. Bu dillər daha çox samodi və türk dilləri ilə yaxındır, eyni zamanda monqol və tunqus dilləri ilə də müəyyən mənada

qohumdurlar. M.Kastren gəldiyi bu nəticədən çıxış edərək fin-uqor, samodi, türk, monqol və tunqus-mancur dillərini «Altay dilləri» adı altında birləşdirmişdir [Bax: 82, 87]. M.Kastren iki dilçiliyi bir-birindən ayırmağın vacibliyini qeyd etmişdir: 1) tarixi dilçilik; 2) spekulyativ və ya fəlsəfi dilçilik. Onun fikrincə, tarixi dilçilik bir ailəyə mənsub olan dillər arasındakı maddi qohumluğu öyrənir. Fəlsəfi dilçiliyin məqsədi isə müxtəlif dillərdəki ümumi qanunauyğunluqları tədqiq etməkdir. M.Kastren hesab edir ki, Altay dilləri arasındakı genetik əlaqəni tarixi dilçiliyin metodları vasitəsilə müəyyənləşdirmək olar. O, 1850-ci ildə yazdığı «Altay dillərində şəxs şəkilçiləri» adlı doktorluq monoqrafiyasında məhz bu metoddan istifadə etməklə tədqiqat aparmışdır [Bax: 82, 88, 4, 17-19].

XIX əsrin ikinci yarısında altayşünaslığın inkişafında Avstriya sanskritoloqu Anton Bollerin tədqiqatlarının əhəmiyyətli rolu olmuşdur. Macar dilinin fin-uqor və digər Altay dilləri arasındakı yerini müəyyənləşdirməyi qarşısına məqsəd qoyan A.Boller əvvəlcə fin-uqor dillərində fonetik hadisələri, təsriflənməni və hallanma sistemini müqayisə etmiş, sonradan samodi, tunqus, monqol və türk dillərini tədqiqata cəlb etmişdir. O, sonradan ilk dəfə olaraq yapon dilinin də Altay dil ailəsinə aid olduğunu sübut etməyə səy göstərmişdir. A.Boller məqalələrində Altay (ümumilikdə Ural-Altay) dillərində şəkilçilər, zaman və fel formalarına xüsusi diqqət yetirmişdir [Bax: 82, 88-90].

XIX əsrin sonu XX əsrin əvvəlində Sibirdə yaşayan türk xalqlarının dilləri haqqında geniş tədqiqatlar aparmış akademik V.V.Radlovun da Altay dilləri barədə mülahizələri maraq doğurur. Əvvəlcədən qeyd edək ki, V.V.Radlov tanınmış alman dilçisi V.Şottun yetirməsi olmuş və onun Ural-Altay dillərinə həsr olunmuş tədqiqatlarını dərindən mənimsəyə bilmişdir [Bax: 81, 96].

V.V.Radlov altayşünaslıq problemlərinə xüsusi tədqiqatlar həsr etməmişdir. Ancaq V.Şottun şagirdi olduğu üçün mancurşünaslıqla xeyli məşğul olmuş, tunqus-mancur dillərinin öyrənilməsində meydana çıxmış problemlərin həllinə can atmışdır. «Şimali türk dillərinin fonetikası» adlı əsərində türk dillərindəki fonetik hadisələri daha aydın izah etmək üçün digər Altay dillərini müqayisəyə cəlb edən V.V.Radlov haqlı olaraq qeyd edir ki, Ural-Altay dillərinin onların dialektləri əsasında öyrənilməsi daha məqsədəuyğundur və bu, qədim yazılı abidələrin olmaması faktını kompensasiya edə bilər [Bax: 81, 97].

V.V.Radlov İ.A.Boduen de Kurtenenin ideyası ilə razılaşaraq fonetik hadisələrdə morfoloji məna görmüşdür. Məhz bu baxımdan o, ahəng qanununu türk dillərinin aqqlütinativ quruluşu ilə əlaqələndirmiş, onun mövcudluğunda morfoloji mənanın xüsusi əhəmiyyət kəsb etdiyni göstərmişdir. V.V.Radlov Ural-Altay dillərini bu dillərdə ahəng qanununun intensivlik dərəcəsinə görə təsnif etmişdir: 1) ahəng qanununun morfoloji mənasız, yalnız fonetik hadisə olduğu dillər (samodi dilləri); 2) kök və şəkilçinin vokalizasiyasının ahəngin qanunauyğunluğuna tabe olduğu dillər (tunqus dilləri); 3) saitlərin ahənginin ciddi qanunauyğunluğa malik olduğu dillər (fin, monqol və türk dilləri) [Bax: 81, 98].

XIX əsrin sonunda alman alimləri Villi Banq və Henrix Vinkler də altayşünaslığın müxtəlif problemlərinə həsr olunmuş monoqrafiyalar, məqalələr çap etdirmişlər. Bu əsərlərlə həmin əsrdəki altayşünaslığa dair tədqiqatlara yekun vurmaq olar.

Ural-Altay nəzəriyyəsinin tərəfdarları daha çox Ural və Altay dilləri arasında mövcud olan tipoloji uyğunluğu, qrammatik və xüsusən də leksik eyniliyi tədqiqata cəlb etmişlər. Qeyd olunan tipoloji uyğunluqlar əsasən bunlardır:

1. Fonetikada: a) saitlərin ahəngi; b) samitlərin assimilyasiyasının ümumi qanunauyğunluqları; c) söz kökündə cingiltili samitlərin sabitliyi; ç) sözün tək samitlə başlanması; d) vurğunun yerinin sabitliyi və s.

2. Morfologiyada: a) aqqlütinasiyanın mövcudluğu; b) onların qoşmalarla birgə mövcudluğu; c) artiklların işlənilməməsi; ç) qrammatik cins kateqoriyasının yoxluğu; d) mənsubiyyət kateqoriyasının mövcudluğu; e) çıxışlıq halın müqayisə dərəcəsi yarada bilməsi; ə) isimlərə cəmdə bir şəkilçinin qoşulması; f) fel formalarının əmələ gəlməsində şəkilçilərin bolluğu; g) sual ədatının mövcudluğu; ğ) şəxs əvəzliyinin (III şəxsin təki) işarə əvəzliyi ilə genetik əlaqəsi; h) qeyri-müəyyən halın və ya əsas halın funksiyasının müxtəlifliyi; x) başqa dillərdə «etmək» feli ilə işlənən konstruksiyanı əvəz edən yiyəlik konstruksiyası və s.

3. Sintaksisdə: a) təyinin cümlədə və söz birləşməsində təyin olunandan əvvəlki mövqedə işlənməsi; b) tamamlayıcının tamamlanandan əvvəlki mövqedə işlənməsi; c) sual konstruksiyasının sual ədatları vasitəsilə yaranması; ç) budaq cümlənin məsdər, feli sifət və feli bağlama tərkibini əvəz etməsi; d) yönlük halla işlənmiş obyektin məntiqi ayrılması; e) sayların və sifətlərin təyinedici funksiyalarının dəyişməzliyi və s.

Ural-Altay dillərinin qohumluğunu irəli sürənlər qeyd edirlər ki, Ural-Altay dil birliyi sonralar ayrılaraq iki böyük dil ailəsinə ayrılmışdır. Bunlardan biri Ural dilləri ailəsi, digəri isə Altay dilləri ailəsidir. Ural dil ailəsi sonrakı diferensiasiya nəticəsində iki budağa bölünmüşdür: 1) fin-uqor budağı (buraya fin və uqor qrupları daxildir); 2) samodi budağı (samodi və yukagir-eskimos-aleut qrupları). Altay dilləri ailəsi də öz növbəsində üç dil budağına bölünmüşdür: 1) türk-monqol budağı (türk və monqol qrupları); 2)

tunqus-mancur budağı (tunqus və mancur qrupları); 3) yapon-Koreya budağı (yapon və Koreya dilləri).

Ural-Altay nəzəriyyəsinin ilkin mərhələsində tədqiqatçıların əksəriyyəti (Y.Nemet, B.Kollinder, M.Rəsənen, C.Kiekbayev və başqaları) hər bir dil ailəsinə daxil olan dillərin qohumluğunun, hətta ümumilikdə bu dil ailələrinin özünün qohum olması ideyasını müdafiə etmişlər. Qeyd edək ki, Ural-Altay dillərinin başqa dil ailələri ilə qohum olması fikrini də irəli sürənlər olmuşdur. Məsələn, bəzi tədqiqatçılar qeyd edirlər ki, Ural-Altay dilləri dravid (tamil, kannad və s.), yenisey (ket, kott, arin, assan) dilləri ilə qohumdurlar. V.V.Banq daha irəli gedərək, bu dil ailəsinin nəinki öz aralarında, hətta hind-Avropa dilləri ilə qohum olması qənaətinə gəlmişdir. X.Pedersen isə ümumilikdə hind-Avropa, kartvel, sami və hami dillərini Ural-Altay dilləri ilə qohum dillər hesab etmişdir [Bax: 149, 62]. Ancaq bu dil ailələrinin qohumluğu çox az inandırıcı görünmüş və tədqiqatlar istənilən nəticəni verməmişdir. Buna görə də Ural-Altay dillərinin qohumluğu problemi dilçilikdə öz əhəmiyyətli həllini tapmamışdır, üstəlik ideyanın tərəfdarları sürətlə azalmışdır.

Ural-Altay nəzəriyyəsi öz əhəmiyyətini itirdikdən sonra Altay dillərinin (türk, monqol, tunqus-mancur dilləri) qohumluğu məsələsi dilçilik üçün aktual problemə çevrilmişdir.

Məlumdur ki, müqayisəli dilçiliyin banisi hesab edilən F.Bopp sanskrit dilinin bir sıra dillərlə (xüsusən Avropa və Asiyanın əksər dilləri ilə) qohumluğu ideyasını bu dillərdə kök və şəkilçilərin oxşarlığına əsaslanaraq irəli sürmüşdür. Yalnız bundan sonra söz köklərinin və qrammatik morfemlərin ümumiliyi hind-Avropa dilçiliyində dillərin qohumluğunu sübut edən əsas xüsusiyyət kimi qəbul olunmuşdur. Məhz bu baxımdan Altay dillərini müqayisəli-tarixi metodla öyrənən ilk tədqiqatçı M.Kastren olmuşdur. V.Şott və

M.Kastren belə qənaətə gəlmişlər ki, şimal-şərqi Avropanın və Sibirin çoxlu sayda bir-birinə qohum olan dillərinin qədim vətəni Altay olmuşdur [Bax:145, 51].

Qeyd edək ki, əgər əvvəllər Altay dil ailəsinə türk, monqol, tunqus-mancur dilləri daxil edilirdisə, sonralar Y.D.Polivanov və Q.İ.Ramstedt onun hüdudlarını genişləndirərək yapon və Koreya dillərini də bu ailəyə daxil etmişlər [Bax: 93, 156-164; 92: 45, 83]. Lakin, yeri gəlmişkən, yapon dilinin Ural-Altay dilləri ilə qohum olması fikri V.Şott, De Rosni və J.Hoffman tərəfindən əvvəllər də irəli sürülmüşdü [Bax: 4, 15].

Altayşünaslıq nəzəriyyəsi müqayisəli dilçilikdə birmənalı qarşılanmamışdır. Hal-hazırda bu nəzəriyyəyə iki baxış mövcuddur: pozitiv və skeptik. Məsələyə pozitiv yanaşanlar göstərirlər ki, Altay dilləri (çox vaxt Koreya və yapon dilləri də buraya daxil edilir) arasındakı maddi yaxınlıq onların genetik qohumluğundan irəli gəlir. Tarixin hansısa bir dövründə (ən azı iki min il bundan əvvəl) ulu Altay dili deyilən bir dil mövcud olmuşdur. Sonrakı diferensiasiya nəticəsində həmin ulu dil müasir Altay dillərinə bölünmüşdür. Yeri gəlmişkən qeyd edək ki, qohumluq tərəfdarları diferensiasiya nəticəsində yaranmış müstəqil dillərin sonradan bir-biri ilə qarşılıqlı əlaqəsini də nəzərə almışlar. Ulu Altay dilinin mövcudluğuna şübhə ilə yanaşanlar isə (skeptiklər, bəzən onlara neoaltayşünaslar da deyirlər) bu uyğunluğu tipoloji uyğunluq hesab edirlər. Onlar qeyd edirlər ki, sturuktur cəhətdən uyğun olan bu dillər eyni inkişaf yolu keçmişlər və güclü qarşılıqlı əlaqələr nəticəsində bir-birilərinə həddindən artıq yaxınlaşmışlar.

Pozitiv altayşünasların ilk nümayəndələri N.N.Poppe, B.Y.Vladimirsov, Y.D.Polivanov, Q.İ.Ramstedt olmuşlar. Onlar

nəinki bu nəzəriyyəni inkişaf etdirmiş, hətta onun hüdudlarını genişləndirmişdirlər.

Altay dillərinin qohum olması fikrinin tərəfdarları indi də çoxluq təşkil edirlər. Buraya görkəmli türkoloqlar, monqolşünaslar və tunqus-mancurşünaslar (Q.Vinkler, P.Aalto, V.İ.Sinsius, O.P.Sunik, İ.V.Kormuşin, A.N.Kononov, N.A.Baskakov, V.D.Kolesnikova, K.Kenesbayev, S.C.Nomin-xanov, D.İ.Nasilov, A.P.Dulzon, N.A.Sıramyatnikov, S.A.Sta-rostin və s.) daxildirlər.

Altay dillərinin fonetikasının, qrammatikasının və leksikasının müxtəlif problemlərinin daha dərindən öyrənilməsi görkəmli fin altayşünası Q.İ.Ramstedtin adı ilə bağlıdır. Altay dilləri ilə məşğul olduğu ilk illərdə Q.Ramstedt də bu dillərin genealoji cəhətdən qohum olması fikrini inkar etmişdir. Skeptik altayşünaslar kimi o da bütün uyğunluqların yalnız qarşılıqlı əlaqə nəticəsində meydana gəlməsi qənaətində olmuşdur. Lakin o, 1910-cu ildə Sankt-Peterburq Universitetində altay-şünaslığın problemlərinə dair sistemli kurs apararkən bu məsələyə münasibətdə öz mövqeyini dəqiqləşdirmişdir. Bundan sonra qırxillik elmi fəaliyyəti dövründə Ramstedt əldə etdiyi materialları təkmilləşdirmiş və tunqus-mancur, Koreya dillərinin hesabına Altay dil ailəsinin hüdudlarını genişləndirmişdir. Lakin tədqiqatçının uzunmüddətli tədqiqatı yalnız onun ölümündən sonra işıq üzü görmüşdür [Bax: 65, 23].

Q.Ramstedtin fikrincə, altayşünaslıq nəzəriyyəsi ümumi müqayisəli-tarixi dilçilikdən ayrılmış bir qoldur. O, haqlı olaraq hesab edir ki, altayşünaslığın qarşısında duran əsas məsələ Altay dil ailəsini müəyyən edən qanunları tədqiq və izah etməkdən ibarətdir.

Q.Ramstedt XX əsrin əvvəllərində daha çox fin-uqor və monqol dillərinin görkəmli tədqiqatçısı kimi tanınmışdır. O, Altay

dillərinin fin-uqor dilləri ilə əlaqəsini inkar edərək Koreya və qədim yapon dilini bu ailəyə daxil etmişdir [Bax: 26, 35-36].

Q.Ramstedt ilk növbədə türk və monqol, tunqus-mancur dillərinə aid külli miqdarda material toplamış, zəngin ədəbiyyatla tanış olmuşdur. Sonra bu dillərin fonetikasını və morfologiyasını müqayisə etmiş və onlar arasında qırılmaz əlaqənin mövcud olduğu qənaətinə gəlmişdir. Bu sahədə tədqiqatlarını genişləndirən Q.Ramstedt həmin dillərin eyni kök dildən törədiyini göstərmiş, türk-monqol-tunqus-mancur ulu dilini bərpa etməyə cəhd göstərmiş və müəyyən mənada buna nail olmuşdur.

Q.Ramstedtin Altay dilləri ilə bağlı apardığı tədqiqatlar onun ölümündən sonra Pentti Aalto tərəfindən 1952-ci ildə «Altay dilçiliyinə giriş» adı altında çap edilmişdir. Əsər üç hissədən ibarət olmuşdur: I hissə–Altay dillərinin müqayisəli fonetikası, II hissə–Altay dillərinin müqayisəli qrammatikası, III hissə–I və II hissələrin fonetik, leksik və qrammatik göstəriciləri. Bunlardan yalnız ikincisi 1957-ci ildə rus dilinə tərcümə edilərək çap olunmuş və altayşünasların stolüstü kitabına çevrilmişdir.

Q.Ramstedt bu əsərində daha çox kök və şəkilçi morfemlərə, söz formasının dəyişməsinə, yeni söz yaranmasına, nitq hissələrinə, onların təsnifatına xüsusi diqqət yetirmişdir.

Q.Ramstedtin Altay dillərinin leksikasına həsr etdiyi ən böyük əsəri «Kalmıkca lüğət»dir. O, burada müxtəlif Altay dillərinin materialından istifadə etmiş, demək olar ki, bütövlükdə Altay dillərinin müqayisəli-tarixi lüğətini yaratmışdır [Bax: 29, 11].

Q.Ramstedt altayşünaslıqda Ramstedt-Pellio fonetik qanunu ilə də məşhurdur. Bu qanun bir neçə Altay praformalarına tətbiq olunsa da, əsasən türk və monqol dillərinə aiddir. Tədqiqatçı belə bir qənaətə gəlmişdir ki, ulu Altay dilində söz əvvəlində hansısa kar

spirant (sürtünən) ¨ işlənmişdir. Həmin spirant bəzi müasir Altay dillərində özünü müxtəlif variantlarda göstərir, bəzilərində isə ümumiyyətlə, heç bir iz buraxmayıb. Q. Ramstedtdən fərqli olaraq Pellio bu fonemin kar spirant yox, partlayan samit oluğunu qeyd etmişdir. Sonradan müxtəlif dilçilər bu qanunun əhatə dairəsini genişləndirmişlər. A.Sovajo Ramstedt-Pellio qanununu Ural dillərinə, D.Şinor hind-Avropa dillərinə tətbiq etmişdir [Bax: 145, 51].

Q.Ramstedtdən sonra başqa dilçilər də Altay dillərinin qrammatikasına, fonetikasına əsaslanaraq samballı fikirlər irəli sürmüşlər. Məsələn, B.Y.Vladimirsovun fikrincə, türk, monqol və tunqus-mancur dilləri arasındakı qohumluq əlaqəsinin əsas göstəriciləri fonetika sahəsində mövcud olduğu kimi, morfologiya, sintaksis və leksika sahələrində də mövcuddur. Lakin bu əlaqəni sübut edən əsas dəlillər həmin dillərin morfologiyasında daha çox özünü göstərir [34, 46].

Y.D.Polivanova görə, türk, monqol, tunqus-mancur dillərini aşağıdakı prinsiplərə görə qohum hesab etmək olar: 1) morfologiyanın şəkilçiləşmə tipində olması; 2) vurğunun daimi yeri (ilk hecada) və ekspirator xarakteri; 3) ahəng qanunu; 4) fonetik uyğunluqların ümumi xarakteri və s. [93,156-164].

V.K.Metyusa görə, saitlərin ahəngi, qalın, partlayan samitlərin ikili bölünməsi, söz əvvəlində cingiltili samitlərin az işlənməsi, saitlərin səlisliyi və dayanıqlığı, *ŋ*/*n*-nın söz sonunda dayanıqlı olmaması, samit səslər qrupunun söz əvvəlində və sonunda işlənməməsi, qoşa və yaxud uzun samitlərin işlənməməsi Altay dillərinin qohumluğunu sübut edən amillərdir [Bax: 145, 54].

J.Deni Altay dillərinin qohumluq prinsiplərinin aşağıdakılar olduğunu göstərir:

1. Fonetikada–saitlərin ahəngi, söz əvvəlində sonor samitlərin az işlənməsi, söz sonunda *n* səsinin davamsızlığı, söz kökündə və şəkilçilərdə geminat (uzun) samitlərin işlənməməsi, söz əvvəlində qovuşuq samitlərin işlənməməsi və s.

2. Morfologiyada–qrammatik cinsin yoxluğu, yalnız iki qrammatik kəmiyyətin (tək və cəm) mövcudluğu, «təmiz» kök morfemlərin işlənə bilməsi, morfologiyaların (hər bir dilin) aqqlütinativ – şəkilçiləşmə xarakterində olması, bir tipli təsriflənmənin mövcudluğu və s.

3. Sintaksisdə–cümlədə sözlərin sırası (ikinci dərəcəli üzvlərin baş üzvlərin ardınca gəlməsi), bağlayıcıların və nisbi əvəzliklərin, demək olar ki, yoxluğu və s. [Bax: 145, 54].

Altayşünaslıq nəzəriyyəsinə skeptik mövqedən yanaşanların ən görkəmli nümayəndəsi polyak dilçisi V.Kotviç hesab olunur. V.Kotviç Altay dillərini müqayisəyə cəlb edərək onların genetik cəhətdən qohum deyil, tipoloji cəhətdən uyğun olması fikrini irəli sürmüşdür. V.Kotviçdən sonra bir sıra dilçilər onun gəldiyi nəticə ilə razılaşaraq Altay dillərini qohum hesab edənləri tənqid etmişlər.

V.Kotviç «Altay dillərinə aid tədqiqat» əsərində təkcə Altay ailəsinə daxil olan dillər arasında mövcud olan uyğunluğu və fərqi göstərməmiş, eyni zamanda onların ümumi inkişaf yolunu izləməyə səy göstərmişdir. Müəllif bu əsərində Altay dillərini müqayisəli-tutuşdurma metodu ilə tədqiq etmişdir və türk, monqol, tunqus-mancur dillərinin qrammatik quruluşunu müfəssəl göstərməyə can atmışdır [65].

V.Kotviç tədqiqatının sonunda qeyd etmişdir ki, türk, monqol, tunqus-mancur tayfaları bir neçə əsr əvvəl Çinin şimalında yaşamışlar. Onlar müxtəlif dillərdə danışsalar da, dillərində struktur uyğunluq mövcud olmuşdur. Başqa qrupların təsiri altında bu

tayfalar tez-tez birləşib ayrılmışlar və bu təsirin nəticəsində onların dilləri özünəməxsus xüsusi əlamətlər qazanmışdır [65, 345-346]. Bu fikirlər V.Kotviçin və ondan sonra gələn ardıcıllarının Altay dillərinin qohumluğuna skeptik mövqedən yanaşmasına səbəb olmuşdur.

V.Kotviç tədqiqatında türk və monqol dillərində sözün strukturu, türk, monqol və tunqus-mancur dillərində isim və fel şəkilçilərinin xüsusiyyətləri, nitq hissələri, ahəng qanunu və s. problemlərə xüsusi diqqət yetirmişdir.

V.Kotviçin Altay dillərinə aid tədqiqatlarından danışarkən qeyd etmək lazımdır ki, bu sahəyə aid özünəqədərki bütün ədəbiyyatla tanış olmuş və geniş ümumiləşdirmələr apara bilmişdir. O, türk, monqol, tunqus-mancur dillərinin materialları əsasında hesablama apararaq göstərmişdir ki, monqol dilləri ilə türk dilləri arasında 50% morfoloji, 25% leksik uyğunluq vardır. Monqol və türk dilləri ilə tunqus-mancur dilləri arasında 5% morfoloji, 10% leksik uyğunluq vardır. Bununla belə V.Kotviç bu uyğunluğu adı çəkilən dillərin qohum hesab edilməsi üçün kifayət hesab etməmişdi [65, 351].

Biz tunqus-mancur dillərinin görkəmli tədqiqatçısı O.Sunikin o nöqteyi-nəzəri ilə razılaşırıq ki, monqol və digər türk dilləri ilə müqayisədə monqol, yakut və ya tuva dilləri arasındakı münasibət V.Kotviçin hesabladığı kimi deyildir. Yakut və even, yaxud mancur və monqol dilləri arasındakı münasibət də digər türk və tunqus-mancur, monqol və tunqus dilləri ilə müqayisədə bu qəbildəndir [125, 16].

Beləliklə, V.Kotviç Altay dilləri arasında mövcud olan uyğunluğu genealoji yox, tipoloji hesab edirdi. O yazırdı ki, xüsusi Altay dil ailəsinin mövcudluğu haqqında danışmaq olar. Lakin onun

əsasında genetik əlaqə yox, tipoloji uyğunluq dayanır ki, bunu da türk, monqol və tunqus dillərinin eyni inkişaf yolu keçmələri ilə izah etmək olar [65, 351-352]. Ancaq V.Kotviç bəzi məqamlarda əvvəlki fikirlərinin əksinə olaraq Altay dillərinin qohumluğunu və onların ulu bir dildən törəməsi fikrini də qəbul edərək qeyd edir ki, hər halda bu ulu dilin mövcudluğunu çox qədimlərə aid etmək lazımdır [65, 351].

V.Kotviçdən sonra A.Şerbak, C.Klouson, G.Dörfer, L.Liqeti, Q.Sanjeyev və başqaları Altay dillərinin qohumluğunu inkar etmişlər. Əvvəlcədən qeyd edək ki, skeptik altayşünaslar Altay dillərinin qohumluğunu inkar edərkən əsasən bu dillərin leksik səviyyəsindəki uyğunsuzluq mövqeyindən çıxış edirlər.

Məlum olduğu kimi, ümumiyyətlə, dilçilikdə müqayisəli baxış yarandığı vaxtdan dillərin qohumluğunu sübut və ya inkar etmək üçün leksikanı deyil, qrammatik quruluşu əsas götürmüşlər. Məsələn, müqayisəli-tarixi metodun banisi F.Bopp sanskrit, yunan, latın, fars və german dillərinin qohumluğundan danışarkən U.Counzun təklif etdiyi kimi dillərin qrammatik quruluşunu müqayisəyə cəlb etmişdir. Ona görə ki, xalqların bir-birilə qarşılıqlı münasibətləri nəticəsində bir dildən digərinə külli miqdarda söz keçə bilər. Buna görə də R.Rask qrammatik uyğunluğun müəyyənləşdirilməsini dillərin qohumluq münasibətini aydınlaşdırmaqda əsas vasitə hesab edir. O yazırdı ki, qrammatik uyğunluq qohumluğun, yaxud mənşə ümumiliyinin ən mötəbər əlamətidir, çünki məlumdur ki, başqa bir dilə qarışan dil həmin dildən hal və təsriflənmə formalarını fövqəladə hallarda qəbul edir, yaxud, daha doğrusu, qəbul etmir, əksinə öz xüsusi formalarını da itirir [24, 267-268].

Ümumiyyətlə, müqayisəli-tarixi metodun ən görkəmli nümayəndələri müqayisəyə cəlb etdikləri dillərin səs uyğunluqlarına və morfoloji əlamətlərin uyğunluğuna xüsusi diqqət yetirmişlər [90: 6-7, 11]. Bütün bunlardan belə nəticəyə gəlmək olar ki, dilin leksik səviyyəsindən çıxış edərək dillərin qohum olub-olmamasını sübut etmək mümkün deyildir, çünki dilin leksik səviyyəsi digər səviyyələrə nisbətən daha az dayanıqlıdır. Ekstralinqvistik təsirlər özünə ilk növbədə leksik qatda yer tapır və leksik səviyyə inteqrasiya üçün çox əlverişlidir. Məhz bu baxımdan dillərin leksik tərkibi qohumluq probleminin həllində az əhəmiyyətlidir.

Skeptik altayşünaslar içərisində A.Şerbakın mövqeyi xüsusilə diqqəti cəlb edir. O, müxtəlif illərdə yazdığı məqalələrdə Altay dilləri arasındakı mövcud əlaqənin genetik qohumluğun deyil, tipoloji uyğunluğun nəticəsi olduğunu qeyd etmişdir [142; 143; 144; 145; 146; 147; 148]. A.Şerbak altayşünaslığın müqayisəli-tarixi dilçiliyin qollarından biri olduğunu qəbul etsə də, elə bil qəsdən Altay dillərində uyğun olmayan leksik paralellər tapmağa cəhd göstərmişdir. O, fikrini sübuta yetirmək üçün üç tematik qrup (kosmik cisimlərin və təbiət hadisələrinin adlarını, ilin fəsillərinin, gecə və gündüz adlarını, ev heyvanlarının adlarını) götürərək onlar arasında uyğunsuzluq olduğunu qeyd etmişdir. A.Şerbakın fikrincə, bu qruplar təsadüfən seçilməmişdir, çünki onlardan əvvəlki iki qrupa aid olan sözlər dildə daha qədim və dayanıqlı olur. Həmin sözlər aşağıdakılardır:

**A. Kosmik cisim və hadisə adları:**

| **Mənası** | **Türk** | **Monqol** | **Tunq. - mancur** |
|---|---|---|---|
| ay | āj | saran | bïjaγa (bïāγa) |

| | | | |
|---|---|---|---|
| günəş | kǖn | naran | sigün (dïlača) |
| ulduz | g ultus | podun | xōsïqta |
| səma | kök | oγtorγoj | saŋna |
| yer | g är | γaǰar | dunra |
| su | suβ( ˷suγ) | usun | mő |
| od | Ōt | γal | toγo |
| dolu | tōlï | mönder | bōna (boγuna) |
| buz | pūs | mölisün | ǰükä |
| ildırım | g aśin | čakilγan | hōsïn |
| qar | qār | časun | xïmanra |
| yağış | g aγmur | buruγān | tügdä |
| şeh | čïq | siqüder | siläksä |
| qırov | qïraγu | qïraγu | - |
| bulud | pulut | egülen | tőguksä |

**B. İl, fəsil, gecə və gündüz adları:**

| **Mənası** | **Türk** | **Monqol** | **Tunq. - mancur** |
|---|---|---|---|
| il | g ïl | pon | aŋa |
| payız | kǖs | namur | boto |
| qış | qïš | ebül | tőgä |
| yaz | g ās | qabur | nälki (näŋni) |
| yay | g äj | ǰun | ǰuγa |
| gün | kǖn | edür | inäŋi |
| gecə | kǖn | sőńi | dolbo |

| | | | |
|---|---|---|---|
| səhər | ā̈r | öglüge | tïma |
| gecə | kā̈č | udeši | siksā̈ |

**C. Ev heyvanlarının adları:**

| **Mənası** | **Türk** | **Monqol** | **Tunq. - mancur** |
|---|---|---|---|
| at | at | morin | morin |
| axta at | aqta, alaša | axta | aqta, alašan |
| ayğır | aδγïr | aǰirγa | aǰirγan, aǰirγa |
| qısır, sonsuz | qïsïr | keüser | kisari |
| birillik ayğır | qulun | unaγan | unaxan |
| iki, üç yaşlı erkək heyvan | γunan | γunan | γunan |
| iki, üç yaşlı dişi heyvan | γunăǰïn | γunajin | - |
| öküz | oγuz, öküz | üxer | hukur |
| inək | iŋäk | ünegen | inak ogus |
| buğa | buqa | buqa | muxašan, būqa |
| buzov | bozaγu | bizaγu | - |
| dəvə | täbä | temeqen | temen, temeden |
| qoyun | qojïn, qonïn | qonin | xonin, konin |
| qoç | qoč, qočqar | quča | xusa xonin |

| | | | |
|---|---|---|---|
| quzu | qozï | quraγan | kurkan |
| birilik dəvə balası | bota, botuq | botuγan | - |
| ikillik dəvə balası | tajlaq | tajilaq | - |
| üçillik dəvə balası | torum | torum | - |
| damazlıq dəvə | buγra | buγura | - |

[144, 24-27].

Əvvəla, qeyd edək ki, A. Şerbakın müqayisəyə cəlb etdiyi leksik paralellik bütövlük, sistematiklik təşkil etmir. Çünki məlumdur ki, müqayisə üçün elə sözləri seçmək lazımdır ki, dildə xeyli qədimdən mövcud olsun. Belə sözlərə daha vacib və həyati mənaları ifadə edən adlar daxildir. Bunlar qohumluq terminləri, bədən üzvlərinin adları, bəzi heyvan və bitki adları, rəng adları, qədim əmək alətlərinin, əmək proseslərinin və əmək məhsullarının adları, bəzi əvəzliklərdir [90, 16].

Göründüyü kimi, A.Şerbak bunlardan yalnız bəzi heyvan adlarını (III tematik qrup) müqayisəyə cəlb etmiş və demək olar ki, fikrinin əksinə olaraq bütövlükdə leksik uyğunluq silsiləsi əldə etmişdir. O, özü də etiraf edərək yazır ki, göstərilən tematik qrup çərçivəsində bütün uyğunluqlar birbaşadır və təsadüfi paralellik çətin ki olsun. Lakin sonradan müəllif ehtimallara əsaslanaraq buradakı bir çox sözlərin kökünü başqa dillərdə axtarmağa cəhd göstərmişdir. Məsələn, türk. *öküz*, monq. *üxer*, tunq. (even) *ogus* sözünü əminliklə hind-Avropa mənşəli (toxarca) *okso* sözü ilə bağlayır və əks keçid ehtimalını nəzərə almır [144, 28].

Digər tərəfdən, I və II tematik qruplardakı sözlərin uyğunsuzluğu heç də adı çəkilən dillərin qohumluğunu inkar etmir. Birincisi, ona görə ki, məşhur altayşünas V.Şottun qeyd etdiyi kimi, iki dilin qohumluğundan danışarkən ilk növbədə həmin dillərdəki söz köklərinin və qrammatik formaların müqayisəsinə fikir vermək lazımdır. Digər tərəfdən, qohum dillərdə əsas məna ifadə edən terminlərin üst-üstə düşməməsi həmin dillər arasında qohumluğun olmamasından xəbər vermir [82, 81]. İkincisi, ona görə ki, eyni məna ifadə edən, lakin səslənməyə görə fərqlənən sözləri müqayisə etmək olmaz [90, 16], çünki belə olarsa, qohumluğuna şübhə edilməyən müxtəlif dillərdə də A. Şerbakın göstərdiyi I və II tematik qruplar üzrə uyğunsuzluqlar müşahidə etmək olar. Məsələn:

**I tematik qrup**

| **mənası** | **rus.** | **Fran.** | **alm.** | **ital.** | **isveç.** |
|---|---|---|---|---|---|
| ay | luna | lune | Mond | luna | máne |
| günəş | solnüe | soleil | Sonne | sóle | sol |
| ulduz | zvezda | etoile | Stern | stella | stjarna |
| səma | nebo | ciel | Himmel | cielo | himmel |
| yer | zemlə | terre | Erde | terra | jorden |
| su | voda | eau | Wasser | acqua | vatten |
| od | oqonğ | feu | Feuer | fioco | eld |
| buz | led | glace | Eis | ghiaccio | is blixt |
| ildırım | molniə | éclair | Blitz | fulmine | blixt |
| qar | sneq | neige | Schnee | neve | snö |
| yağış | dojdğ | pluie | Regen | pioggia | regn |

**II tematik qrup.**

| mənası | rus. | fran. | alm. | ital. | isveç. |
|---|---|---|---|---|---|
| il | qod | annee | Jahr | anno | ar |
| payız | osenğ | automne | Herbst | autunno | höst |
| qış | zima | hiver | Winter | inverno | winter |
| yaz | vesna | printemps | Frühling | primavera | var |
| yay | leto | ete | Sommer | estate | sommar |
| gün | denğ | jour | Tag | giorno | dag |
| gecə | noçğ | nuit | Nacht | notte | natte |
| səhər | utro | matin | Morgen | mattino | morgon |
| axşam | veçer | soir | Abend | sera | aftan |

A.Şerbak başqa bir məqaləsində daha kəskin mövqe tutaraq altayşünaslığı tamamilə lazımsız, hətta zərərli məşğuliyyət hesab etmişdir. Onun fikrincə, Ural-Altay nəzəriyyəsi və onunla bağlı nəticəsiz paralellər axtarışı türk, monqol, tunqus-mancur dillərinin dərindən öyrənilməsinə mane olmuşdur. Buna görə də o, altayşünaslığın tarixə zidd olduğunu qeyd etmişdir. Monqol və tunqus-mancur dillərinin materialları əsasında türk praformalarını bərpa etməyin isə qeyri-mümkünlüyünü vurğulamışdı [149, 69-70]. Əslində, A.Şerbak özü də altayşünaslığı müqayisəli-tarixi dilçiliyin bir qolu hesab etmişdir və məhz buna görə altayşünaslığı tarixə zidd bir nəzəriyyə hesab etmək öz fikrini inkar etməkdir. Eyni zamanda iki yüz ilə yaxın bir müddətdə dünyanın tanınmış türkoloqlarının,

monqolşünaslarının, tunqus-mancurşünaslarının əldə etdiyi saysız-hesabsız uğurlu nəticələri faydasız adlandırmağı qeyri-elmi qənaət kimi qiymətləndirmək olar. Digər tərəfdən A.Şerbakın əksinə olaraq əksər tədqiqatçıların fikrincə, yalnız Altay dillərinin materialları əsasında bu ailəyə daxil olan hər bir dilin fonetik və morfoloji quruluşunu yenidən qurmaq (rekonstruksiya etmək) olar [Bax: 62, 22; 112, 34-35; 43, 60-63; 130, 14-15; 71, 23-25; 72, 139-142; 35, 32-58; 44, 23-31; 27, 315-321; 60, 322-330; 109, 73].

Altay dillərinin qohumluğunu inkar edən C.Klouson məsələyə başqa səpgidən yanaşmışdır. O, leksikostatis-tikadan və qlottoxronoloji metoddan istifadə etməklə Altay dillərindən seçdiyi leksik vahidlərin müqayisə cədvəlini qurmuş və burada sistematik uyğunsuzluqların mövcud olduğunu qeyd etmişdir. Məsələn:

| **mənası** | **qədim türk.** | **qədim monq.** | **manc.** |
|---|---|---|---|
| | **İsimlər** | | |
| qarın | karïn | ke’eli | hefeli |
| köks, döş | tö:ş (dö:ş), kögöz | če’eǰi | tunggen |
| bulud | bulut | e’ülen | tugi |
| torpaq | top:rak | öser, široy | boihon |
| yumurta | yumurtğa: | ömdegen | umhan |
| tük, qıl | kïl | (h)üsü | funiyehe |
| əl | elig | γar | gaia |
| baş | baş | teri’ün | uju |
| buynuz | büňüz | eber | uyhe |
| diz | ti:z (di:z) | ebüdüg | buhi |
| kök | kök | (h)uǰa’ür/uǰu’r | da |
| qum | kum | elesü(n) | yongga |

| | | | |
|---|---|---|---|
| ailə | uruğ | (h)üre | use |
| dil | tïl (dïl) | kelen | ilenggu |
| su | su:v | usu(n) | muke |
| arxa | arka: | aru | fisa |
| ot | ot | ebesün | orho |
| göl | kö:l (gö:l | na' ur | Omo |
| **Sifətlər** | | | |
| çəki | barça: kop, kamağ | büri, qamuγ | yooni |
| böyük | uluğ, beđük | yeke | amba |
| yeni | yaŋï: | šine | iče |
| qara | kara: | qara | sahaliyan |
| dəyirmi | tegirmi: (degermi:) | tögörigey, tö'erig | muheliyen |
| ağ | a:k | čaγa'an | šanyan |
| sarı | sarïğ | sira (šira) | suwayan |

[53, 33-37].

C.Klouson bu mövzuya həsr etdiyi məqalənin əvvəlində seçdiyi metodun əhəmiyyətini əsaslandırmaq üçün dili, onun divergensiyasını karbon qazı ($C_{14}$) və onun radiaktiv izotoplarının parçalanması ilə müqayisə etmişdir. Qeyd etmək yerinə düşərdi ki, əslində bunların müqayisəsi o qədər də uğurlu deyildir, çünki təbiət və cəmiyyət qanunları arasında nə qədər oxşar xüsusiyyətlər nəzərə çarpsa da, kəskin fərqlər də mövcuddur. Başqa bir tərəfdən, ümumiyyətlə, dillərin qohumluğu probleminin həll olunmasında leksikostatistik və qlottoxronoloji metodlar uğurlu vasitələr hesab edilmir, çünki hər iki metod dilin o qədər də dayanıqlı olmayan leksik səviyyəsindən çıxış edir. Leksikostatistika daha çox qanun,

qanunauyğunluq və kateqoriya nümayiş etdirməyən statik vahidlərin alqoritmini müəyyənləşdirir. Başqa sözlə, dilin leksik vahidləri arasında riyazi paralellər aparır. Aydındır ki, dil leksik səviyyədə inteqrasiya üçündür. Bu səviyyədə substrat, superstrat və adstratların iştirakı şübhəsizdir. Dilə digər dillərdən leksik vahidlər çox asanlıqla daxil ola bilir və həmin dildə vətəndaşlıq hüququ qazanır. Bu zaman daha çox fonetik– akustik qanunauyğunluqlar ona təsir edir, bir növ alınmış vahidi konkret dilin ifadə imkanlarına uyğunlaşdırır. Bu isə dil hadisəsi deyil, nitq hadisəsidir. Məhz buna görə də leksikostatistika qohumluğu sübut və ya inkar etmək üçün yararlı deyildir. Qlottoxronologiya isə qarşılaşdırılan iki dilin qarşılıqlı əlaqəsi haqqında son dərəcədə ilkin məlumatları tez əldə etməyə imkan verə bilən əlverişli metoddur. «Lakin qarşılaşdırılan iki dil daha çox məlumdursa, nöqsansız nəticələr əldə etməyə imkan verən yeganə metod müqayisəli-tarixi metoddur» [36, 34].

C.Klousonun leksikostatistik metod vasitəsilə altayşünaslıq nəzəriyyəsinin səhv və ya yolverilməz olduğunu sübut etmək cəhdi müxtəlif dilçilər tərəfindən tənqid olunmuşdur. Hətta Altay dillərinin qohumluğunu inkar edən bəzi tədqiqatçılar da bu tənqidə qoşulmuşlar. Məsələn, G.Dörfer C.Klousonu düzgün metod seçməməkdə tənqid edən L.Gersenberqlə razılaşdığını bildirir [39, 50]. O hesab edir ki, Klousonun metodu qeyri-qənaətbəxşdir [38, 35]. L.Liqeti də göstərir ki, dilləri müqayisə edərkən hər şeydən əvvəl qlottoxronoloji uyğunsuzluğun altında gizlənmiş sözlərin həqiqi etimoloji əlaqəsinə fikir vermək lazımdır. O, C.Klousonun leksikostatistik cədvəlində uyğun gəlməyən bir neçə türk, monqol, tunqus-mancur mənşəli sözlər arasındakı etimoloji əlaqəni müəyyənləşdirmişdir. Məsələn:

Türk.*kögüz* «döş, qadın döşü» sözü monq.*če’eǰi* «döş» sözü ilə bərabər həm də *kökö* «qadın döşü», manc.*xuxun* «1.döş; 2.süd», udeg., oro. *uku*, neqi.*ukun*, evenk.*ukun*, *χukun*, *χukuχu*, even.*uken* sözləri ilə etimoloji uyğunluq təşkil edir.

Türk.*topraq* «torpaq, toz» monq.*tobraγ*, *toburaγ*, *toγuraγ* sözləri ilə (Klousonun cədvəlində *köser*, *široi*) əlaqəlidir. Bu qrupa təbii ki, türk.*toz*, *toγosun*, *to’osun* sözləri də daxildir.

Monq.*γar* «əl» sözünü etimoloji cəhətdən türk.*qar* «əlin yuxarı hissəsi; çiyin» sözü ilə (cədvəldə *elig*) bağlamaq olar.

Türk.*uruγ* «ailə» sözü cədvəldə *hüre* sözü ilə qarşılaşdırılsa da, əslində monq.*uruγ* «ailə; qadın tərəfdən olan qohum; cins; tayfa» sözü ilə birbaşa uyğundur.

Monq.*kelen* «dil» sözü *kele* «demək, söyləmək, danışmaq, adlandırmaq», *kelegi* «lal, pəltək» sözləri ilə birlikdə türk.*käläǯi*, *käläčü* «söz», çuv.*kala* «demək, söyləmək» və manc.*xele*, *xelen* «1. danışmaq bacarığı; 2. kəşfiyyatçı, casus» sözləri ilə etimoloji baxımdan ekvivalentdir.

Türk.*arqa* «arxa» etimoloji cəhətdən monq.*aru* «arxa» sözü ilə əlaqəlidir. Onların digər ekvivalentləri bunlardır: udeg.*aka* «arxa», oro.*atta*, oroç.*akka* neqi.*ajkan*, evenk.*arkan*, even.*arkan* və s [69, 24-26].

L.Liqeti bir sıra sözlər arasındakı etimoloji uyğunluğu bərpa etdikdən sonra C.Klousonun seçdiyi qlottoxronoloji metod vasitəsilə Altay dillərinin qohum olmasını və ya olmamasını sübut etməyin qeyri-mümkünlüyünü göstərmişdir. Onun fikrincə, dillərin qohum olmasını sübut etmək xüsusilə çətindir. Yalnız bunu sübut etmək olar ki, iki və ya bir neçə dil qohumdur və bir ulu dildən törəmişdir. Bu sübut isə qeyri-qənaətbəxş ola bilər. Belə tənqidi metod daha

inandırıcı və qüsursuz arqumentlər olmayana qədər davam edə bilər [69, 30].

L.Liqeti yazır ki, Altay dil birliyinin mövcudluğu hind-Avropa və ya fin-uqor dil birlikləri ilə müqayisədə sübut olunmayıb. Bunun iki səbəbi ola bilər: ya həqiqətən Altay dilləri bir ulu dildən törəməyiblər və onlar qohum deyillər, ya da əksinə qohumdurlar, ancaq onların indiki vəziyyəti o qədər xüsusi və qeyri-bərabər inkişafın nəticəsidir ki, qohumluqları məlum modellərlə (hind-Avropa, fin-uqorda olduğu kimi) sübut oluna bilmir [69, 34]. Bizcə, həqiqətən də Altay dillərinin qohumluğu probleminin yüz əlli ilə yaxın bir müddətdə tam həll olunmamasına mane olan başlıca səbəb L.Liqetinin göstərdiyi ikinci amildir, çünki türk, monqol, tunqus-mancur dillərinə aid olan yazılı abidələrin müxtəlif dövrlərə aid olması onların qeyri-bərabər inkişafına əsaslı sübutdur. Hətta L.Gertsenberq hind-Avropa dillərindən fərqli olaraq Altay dilləri üçün ümumi say və köməkçi fel sistemlərinin olmamasını (bu altayşünaslıq nəzəriyyəsini tənqid edənlərin irəli sürdüyü əsas arqumentlərdəndir) Altay protoetnik durumunun hind-Avropa protoetnik durumundan fərqlənən başqa tipoloji struktura malik olması ilə əlaqələndirmişdir [36, 36]. Eyni zamanda Altay dillərinin digər dillərə nisbətən az öyrənilməsini (türk dilləri nisbətən istisnalıq təşkil edir) də buraya əlavə etmək lazımdır. Lakin son əlli-altmış il ərzində Altay dillərinin aktiv tədqiqata cəlb olunması nəticəsində bu dillərin qohumluğunu sübut etmək yolunda ortaya çıxan, demək olar ki, əksər problemlər həll olunmaqdadır.

C.Klousonun gəldiyi nəticə ilə razılaşmayan L.Liqeti sonda qeyd edir ki, nə leksikostatistika, nə də qlottoxronologiya altayşünaslıqla bağlı tədqiqatların gələcəyini müəyyənləşdirə bilməz.

Yeri gəlmişkən qeyd edək ki, Azərbaycan dilçisi Ə.Abdullayev də C.Klousonun nəticələri ilə razılaşmayaraq onun fikirlərinə qarşı tutarlı əks arqumentlər qoymuşdur [1, 304-306].

N.A.Sıromyatnikov «Altay dillərində ümumi morfemlərin müqayisəli-tarixi öyrənilməsinin metodları» adlı məqaləsində C.Klousonun altayşünaslıq nəzəriyyəsini qlottoxronologiyanın köməyi ilə inkar edərkən M.Svodeşdən bəhrələndiyini qeyd edir. O yazır ki, M.Svodeş özü də bu yolla dillərin qohumluğunu müəyyən etməyi qeyri-mümkün hesab etmişdir. Əgər Koreya və yapon dillərində nisbətən yeni hadisə olan Çin leksik təbəqəsi haqqında məlumatımız olmasa, C.Klousonun təklif etdiyi metodla onların qohumluğunu sübut edə bilərik [128, 53-54]. N.Sıramyatnikovun bu fikrini analoji olaraq Azərbaycan və ərəb, fars dilləri arasındakı münasibətə də aid etmək olar.

N.Sıramyatnikov həmin məqaləsində C.Klousona cavab olaraq müqayisə metodunun bir neçə ümumi prinsipini göstərmişdir. Məsələn:

1. Predmetlər və onların adları deyil, dil vahidləri müqayisə edilməlidir.

2. Sözlər yox, morfemlər müqayisə edilməlidir.

3. Başqa dillərlə müqayisə üçün söz və morfemlərin fonetik tərkibcə müəyyənləşmiş daha qədim formalarını seçmək (söhbət qədim ümumilikdən gedirsə) lazımdır. Əgər abidələr yenidirsə, müqayisə vasitəsilə qohum dillərdəki daha qədim səslənməni bərpa etmək lazımdır.

4. Leksikanı müqayisəli öyrənərkən bütün dillərdə uyğun mənaları ifadə edən ümumi morfemlər müqayisə edilməlidir. İki-iki öyrənilmə az effektlidir.

5. Ümumi morfemlərin müqayisəsi zamanı müntəzəm fonetik uyğunluq aşkar edilməlidir.

6. Müxtəlif dillərdə morfemləri müqayisə edərkən qohum köklərin mövcudluğunu nəzərə almaq lazımdır.

7. Ümumi təqlidi kökləri, ideofonları, «uşaq dili»nə daxil olan sözləri aşkar etmək lazımdır.

8. Qədim ümumilikdən fərqli olaraq yeni alınmalar müəyyən edilməlidir və s. [128, 53-63].

Görkəmli alman dilçisi G.Dörfer isə Altay dillərinin qohumluğu məsələsinə tamam başqa bir aspektdən yanaşmışdır. O, bu dillərin bazis leksikası əsasında onların genetik qohumluğu barədə fikir yürütməyə cəhd göstərmişdir. G.Dörferin fikrincə, dillərin qohumluğunu sübut etmək üçün bazis leksikasının əhəmiyyətli rolu vardır. O, bədən üzvlərinin adını bazis leksikasına aid edir və bu leksik qatı leksikanın mədəni qatına qarşı qoyur [38, 35-43]. G.Dörfer qeyd edir ki, mədəni qata aid olan sözlər (məs., avtomobil, telefon, titullar və s.) müəyyən mədəni hadisələrlə bağlı yaranmış mənaları ifadə edir, başqa dillərdən tez və asanlıqla alınır. Bədən üzvlərinin adları isə alınma olmur və qohumluq əlaqələrinin izah olunmasında əhəmiyyətli rola malikdir [38, 35].

G.Dörfer keyfiyyət xarakterinə görə bədən üzvlərinin adlarını iki yerə bölür: 1.Nüvə bazisli sözlər (NBS). Buraya alınmayan və ya çox nadir hallarda alınan adlar daxildir; 2.Periferik bazisli sözlər (PBS). Bu qrupa aid olan sözlər çox tez alına bilir. «Baş», «qulaq», «burun», «ağız», «dil», «diş», «saç», «ürək», «əl», «ayaq» kimi sözlər NBS-ə aiddir və onlar əsas fizioloji funksiyaları yerinə yetirən orqanların adlarıdır. «Böyrək», «kiprik», «daban», «alın», «şəhadət barmağı» və s. kimi sözlər isə PBS-ə daxil edilir [38, 37-39].

G.Dörfer NBS-dən 11 (baş, göz, qulaq, burun, ağız, dil, diş, saç, ürək, əl, ayaq), PBS-dən isə 5 (dodaq, barmaq, diz, saqqal, boyun, boğaz) söz seçərək, hind-Avropa, kartvel, sami, dravid, Ural və Altay dillərində onların paralelliyini izləməyə çalışmışdır. O, son nəticədə Altay dillərində həmin paralelliyin daha çox pozulduğunu qeyd etmiş və bu nəticədən çıxış edərək ümumaltay leksikasının qədim qohumluğun deyil, ulu dillərin (Altay ailəsinə daxil olan hər bir dilin protodili) alınmaları əsasında formalaşdığı qənaətinə gəlmişdir [38, 39-43].

Lakin G.Dörfer Altay dillərinin qohumluğunu tamamilə inkar etməyə ehtiyat etmişdir. O yazır ki, «… şübhəsiz, qədim dillərdən alınmalar həqiqi qədim qohumluğa çox yaxındır və çox oxşayır. Məsələn, monq.*ere* «insan»~türk.*er*, yaxud monq.*bora* «boz»~türk.*boz* çox qədim türk formasından (**ere*, **bora*, yaxud **borḭa*) əmələ gəlmişdir. Lakin çətin ki, Q.Ramstedtin və ya N.Poppenin zənn etdiyi kimi, bu sözlər qohum olsunlar, eyni zamanda C.Klouson və A.Şerbakın fikri ilə razılaşmaq olmaz ki, yeni alınmalar V-VII əsrə aiddir. G.Dörfer qeyd edir ki, bu sözlərin alınması yeni eradan əvvələ aiddir. Daha sonra o, deyilənləri belə ümumiləşdirir: **tezis** (Ramstedt, Poppe)–ümumaltay sözləri qohumdurlar; **antitezis** (Klouson, Şerbak)–ümumaltay sözləri sadəcə qədim olmayan alınmalardır; **sintezis** (Liqeti, Dörfer)–ümumaltay sözləri indiki qohumluğa çox oxşayan ulu dil alınmalarıdır» [38, 43].

Hər şeydən əvvəl qeyd etmək lazımdır ki, C.Klousonun metodunu oluqca sadə, təmiz kəmiyyət xarakterli hesab edən və bu metodla dil qohumluğu problemini həll etməyin qeyri-mümkünlüyünü göstərən G.Dörfer özü də bədən üzvlərinin adlarını əhatə edən 16 sözün (11 söz NBS - dən, 5 söz PBS - dən) müqayisəsi ilə əlliyə yaxın dili birləşdirən böyük bir dil ailəsinin qohumluğa

əsaslanıb-əsaslanmadığını söyləməyə cəhd göstərmişdir. Halbuki M.Svodeş bunun üçün 100 söz seçmişdir. S.Yaxontov isə buraya 10 söz də əlavə etmişdir. S.Starostin Altay dillərində həmin sözləri müqayisə etmişdir və əldə olunmuş xeyli sayda uyğunluğun təsadüfi və alınma olmadığını qeyd etmişdir [120, 104-112]. Eyni zamanda burada əsas natamamlıq dialektlərə müraciət olunmamasıdır. Bizcə, leksik səviyyədə problemin həllinə bu cür yanaşan zaman leksik bazisi kompleks halda (qohumluq terminləri, ev heyvanlarının adları, bitki adları və s.) müqayisəyə cəlb etmək daha sistematik və tutarlı olardı. G.Dörfer nüvə bazisli sözləri qohumluğun sübutu üçün daha etibarlı əsas hesab etsə də, onunla periferik bazisli sözlər arasında dəqiq sərhəd olmadığını da etiraf etmişdir [28, 37]. Digər tərəfdən, yalnız 16 bədən üzvünün adının müqayisəsi ilə nəticə çıxarmağa tələsən G.Dörferin əksinə olaraq, V.D.Kolesnikova Altay dil ailəsinə daxil olan hər bir dildə orta hesabla 200-300, hətta tunqus-mancur qrupunda sinonim, variant və alınmalarla birlikdə 600-dən yuxarı bədən üzvünün adı olduğunu müəyyənləşdirmişdir [56, 139-151; 55, 71-103; 54, 257-336]. Eyni zamanda V.Kolesnikova bu bədən üzvlərinin adları içərisində onlarla sözün (G.Dörferin təbirincə desək, nüvə bazisli sözlərin) bütün Altay dil qruplarında ümumi kök elementlərinə malik olduğunu müəyyənləşdirmişdir. «Baş», «üz», «burun», «ağız», «göz», «qulaq», «ənsə», «boğaz», «sinə», «çiyin», «bel» kimi adlar bu qəbildən olan sözlərdir [55, 71]. V.Kolesnikovanın qənaətinə görə, Altay dillərində bədən üzvlərinin adlarının 20-25%-i ortaq kök əsasa malikdir [56, 151].

G.Dörfer qeyd edir ki, bədən üzvlərinin adları heç vaxt başqa dillərdən alınmır və yaxud çox nadir hallarda alınır [38, 37]. Yəni belə demək mümkündürsə, leksikanın bu qatı ya heç vaxt dəyişikliyə uğramır, ya da dəyişiklik çox nadir hallarda baş verir. Lakin istənilən

söz alınma ola bilər, istənilən söz mənasını dəyişə bilər və yaxud dildən çıxa bilər [150, 111]. Qeyd edək ki, müəyyən tarixi dövrlərdə mədəni leksika ilə yanaşı, bazis leksikası dəyişikliyə uğramışdır və bu leksik qata alınmalar keçmişdir. Məsələn, vaxtilə Azərbaycan yazılı dilində «ürək», «baş», «göz», «dil» sözləri ilə yanaşı «qəlb» (ərəb), «dil», «sər», «çeşm», «ləhzə» (fars) sözləri də geniş yayılmışdır.

Digər tərəfdən maraqlıdır ki, G.Dörferin nüvə bazisli leksikaya aid etdiyi 11 sözü qohumluğu hamı tərəfindən qəbul olunmuş hind-Avropa dillərində də müqayisə etdikdə əks nəticələr alınır. Məsələn:

| **mənası** | **rus** | **fran.** | **ing.** | **ital.** | **isveç.** |
|---|---|---|---|---|---|
| 1. baş | qolova | Tête | head | capo | huvud |
| 2. göz | qlaz (oçi) | Oeil | eye | occhio | öga |
| 3. qulaq | uxo | Orielle | ear | orecohio | öra |
| 4. burun | nos | Nez | nose | naso | nöso |
| 5. ağız | rot | Bouche | mouth | bocca | mun |
| 6. dil | əzık | Langue | tongue | lingua | tunga |
| 7. diş | zub | Dent | tooth | dente | tand |
| 8. saç | volos | Cheveu | hair | capello | har |
| 9. ürək | serdüe | Coeur | heart | cuore | hjärta |
| 10. əl | ruka | Main | hand | mano | hand |
| 11. ayaq | noqo | Jambe | leg | piede | fot |

Göründüyü kimi, burada yalnız dörd sözdə (3-cü, 4-cü, 6-cı, 9-cu) ikitərəfli uyğunluq vardır. Lakin G.Dörferə görə, bu cür az miqdarda özünü göstərən uyğunluq qohumluğu sübut edə bilməz.

Qeyd edək ki, qədim slavyan, latın və qədim ingilis dillərində də eyni paralellikləri izləyərkən beş sözdə uyğunluq müşahidə olunmuşdur (yuxarıdakı dörd sözün paralelliyinə *oko-oculus-eāge* paralelliyi əlavə olunur). G.Dörferin məntiqinə görə, bu çox azdır. Halbuki, o, inamla və tam əminliklə göstərmişdir ki, nüvə bazisili sözlərin uyğunluğu hind-Avropa dillərində 81,8% təşkil edir [38, 40].

Bütün əldə olunan nəticələrə əsasən demək olar ki, G.Dörferin təklif etdiyi yalnız bazis leksikasının müqayisəsi yolu ilə də dillərin qohumluğunu (xüsusilə Altay dillərinin) qəti surətdə inkar etmək mümkün deyildir. Əksinə, faktlar qohumluğu söyləməyə imkan verir.

Akademik Layoş Liqeti altayşünaslığa həsr etdiyi məqalələrində Altay dillərinin ümumiliyi probleminin qəti və nöqsansız həlli ilə bağlı qarşıya çıxan bir neçə çətinlikdən söhbət açmışdır [69, 21-33; 70, 133-140; 108, 155-158]. Əvvəlcədən qeyd edək ki, L.Liqeti də Altay dillərinin qohumluğunu tamamilə inkar etməmişdir. O, bu dillərin qohumluğu fərziyyəsini əksəriyyət tərəfindən qəbul olunan və həqiqətə çox yaxın olan fərziyyə hesab etmişdir. Lakin onun fikrincə, bu hələ ki fərziyyə olaraq qalır və tam elmi surətdə sübut olunmamışdır [70,134]. Akademik göstərir ki, altayşünaslığın qarşısına çıxan əsas çətinliklərdən biri Altay dillərinə məxsus olan yazılı abidələrin müxtəlif dövrlərə (türk qrupunda VII-VIII, monqol qrupunda XIII əsrə, tunqus-mancur qrupunda isə XVII əsrə) aid olmasıdır. Məhz bu müxtəliflik müqayisəli-tarixi metodun Altay dillərinə düzgün tətbiq olunmasına maneçilik törədir. L.Liqeti qeyd edir ki, metodun tətbiqində yaranan maneədən başqa digər böyük çətinlik ayrı-ayrı Altay dillərinin kök dildən ayrılandan sonra (deməli, L.Liqeti ulu Altay dilinin mövcudluğunu qəbul edir!) bir-birilərindən çox da təcrid olunmamış halda inkişaf etməsidir. Əksinə,

bu dillərin daşıyıcıları olan tayfalar, xalqlar uzun müddət və intensiv olaraq bir-biriləri ilə təmasda olmuşlar. Təbii ki, bu təmas dillərin lüğət tərkibində olduğu kimi, qrammatik quruluşunda da iz qoymuşdur. Bu təmasın bir hissəsi hipotetik deyildir. Çin mənbələri bu barədə tez-tez məlumat verir. Heç şübhə yoxdur ki, biz altayşünaslıq sahəsindəki müqayisəli-tarixi tədqiqatlarda ancaq ayrı-ayrı dillərdə bilavasitə Altay ulu dilinin davamı olan dil materiallarına əsaslanmalıyıq [70, 134-135].

Bizcə, L.Liqetinin qeyd etdiyi birinci çətinlik Altay dillərinə aid olan yazılı abidələrin müxtəlif dövrlərə aid olması ilə deyil, müqayisəli-tarixi metodun özünün qüsurlu olması və çoxsaylı altayşünaslıq problemlərinin həll olunması üçün kifayət qədər yararlı olmaması ilə bağlıdır. Çünki V.Peretruxin müqayisəli-tarixi metodun nöqsanlarından danışarkən yazır ki, qədim yunan abidələri e.ə. VII əsrə, qədim slavyan abidələri b.e.IX əsrin və qədim litov abidələri XVI əsrə aid olduğundan xronoloji baxımdan fövqəladə dərəcədə pərakəndə və natamam materiallara malikdirlər. Buna görə də bu dillərin inkişaf mərhələlərində abidələrdə təsbit olunmayan dəyişiklikləri müəyyən etmək mümkün deyildir [90, 26; 78, 65].

Digər maneəyə gəldikdə demək olar ki, Altay dillərinin qohumluğundan bəhs edən əksər tədqiqatçılar öz əsərlərində bu dillərin genetik bağlılığından əlavə, ulu dildən ayrıldıqdan sonra onların bir-birilərinə güclü təsir etməsi fikrini də haqlı olaraq ön plana çəkmişlər, çünki dünyada belə təsirlərdən məhrum olan (qohum dillər olub-olmamasından asılı olmayaraq) dil tapmaq mümkün deyildir.

L.Liqetinin gəldiyi son nəticə isə bizcə, altayşünaslıq probleminin elmi izahında müstəsna əhəmiyyətə malik ola bilər.

Tanınmış monqolşünas Q.D.Sanjeyev əvvəllər Altay dillərinin genetik qohumluğu ideyasını qəbul etsə də, sonralar skeptik altayşünasların mövqeyindən çıxış edərək, bu qohumluğa şübhə ilə yanaşmışdır.

Q.Sanjeyev Altay dilləri, xüsusilə türk və monqol dilləri arasındakı fərqləri ümumiləşdirərək əsasən aşağıdakı kimi xülasə etmişdir:

Fonetika sahəsində: 1) monqol dilində *d, q, c* qədim başlanğıc samitlərinin mövcudluğu (bu, türk dillərində sonradan yaranmışdır); 2) monqol dilində *c, q, t, k* və *ş* son samitlərinin yoxluğu (belə samitlər türk dillərində mövcuddur); 3) *n* samiti ilə başlanan sözlərin monqol dilində xeyli miqdarda (4%-ə yaxın) olması (türk dillərində belə sözlər məhduddur); 4) monqol dilində başlanğıc *h* farinqalın varlığı (bəzi türk dillərində bu protetik yaranmışdır).

Qrammatika sahəsində: 1) monqol dilində türk dilləri üçün xarakterik olan *-ma* hissəciyi ilə yaranmış inkarlığın mövcud olmaması; 2) monqol dilində *«ülü»* və *«ese»* inkarlıq ədatlarının mövcudluğu (bu, türk dillərində yoxdur); 3) XIII əsr monqol abidələrində qrammatik cinsin mövcudluğu. Eyni zamanda burada bəzi fel formaları daxili fleksiya yolu ilə ifadə edilmişdir (belə hal türk dilində və abidələrində yoxdur); 4) monqol dilində dörd xəbər formasının mövcudluğu (türk dillərində yalnız bir xəbər forması vardır); 5) monqol dilində cəm və növ formalarının əlamətlərinin nisbi çoxluğu (türk dillərində bunlar yekcinsdirlər) və s [111, 88].

Qeyd etmək istəyirik ki, Q.Sanjeyevin göstərdiyi fərqlər nəinki qohum hesab olunan iki dil ailəsində, hətta bir dil ailəsinə daxil olan ayrı-ayrı dillər arasında da mövcud ola bilər. Bu baxımdan tunqus-mancur dillərinin görkəmli tədqiqatçısı V.İ.Sinsius

Q.Sanjeyevin qeyd olunan mülahizələrini təhlil etdikdən sonra haqlı olaraq yazır ki, dillər arasındakı genetik, morfoloji və tipoloji münasibətlər oxşar deyildir. Məsələn, mancur dili bir sıra neqativ xarakteri ilə digər tunqus-mancur dilləri arasında seçilir. Qrupun digər dillərindən fərqli olaraq, mancur dilində felin şəxsə və kəmiyyətə görə dəyişməsi, adların mənsubiyyət forması yoxdur (bu dildə atributiv əlaqə yiyəlik halın köməyi ilə ifadə olunur), isimlərin hal formasının paradiqması azlıq təşkil edir, başqa tunqus-mancur dillərindən fərqli olaraq mancur dilində qayıdış əvəzliyi yoxdur. Bundan sonra I şəxsin cəminin iki formada (eksklyuziv və inklyuziv) mövcudluğu tunqus-mancur dilləri üçün də xarakterikdir. Belə ki, bu qrupa daxil olan dillərdən üçündə (nanay, ulç, orok dillərində) əvəzliklərin inklyuziv forması yoxdur, əksinə even dillərinin şivələrində isə I şəxsin cəmində eksklyuziv əvəzlik mövcud deyildir [138, 283-284].

V.Sinsiusun fikrincə, Q.Sanjeyevin türk və monqol dilləri üçün qeyd etdiyi cəm şəkilçilərinin yekcinsliyi və ya çoxluğu, fellərin inkar formasınının yaranmasındakı müxtəliflik əhəmiyyətli rol oynamır. Əksinə, Koreya dilindəki inkarlıq vasitələrinin müxtəlif Altay dilləri ilə müqayisəsi (korey.*ani~an* (inkarlıq ədatı) və nan.*ana*; korey.*mot* (inkarlıq ədatı), köməkçi fel *mal-da* və türk.*-ma* şəkilçisi), yaxud Koreya dilində cəmlik əlamətlərinin tunqus-mancur və monqol formativləri ilə üst-üstə düşməsi (korey.*-tıl* və evenk., even., neqi.*-tıl-am-tıl* «atalar», *em-tıl* «analar»; manc. *-ta/ -te –ama-ta*, *eme-te*, eyni zamanda korey.*ne<nău* «insan», evenk., even., neqi.*-nil <*na+il-ak-nil* «böyük qardaşlar», *ek-nil* «böyük bacılar» və s.) böyük maraq doğurur. Həm də Q.Sanjeyevin monqol dilindən gətirdiyi misalların bəziləri (məsələn, qrammatik cins) XIII əsr

monqol yazılı abidələrinə aiddir[1]. Altay dil ailəsi üçün söhbət minillikdən gedir [138, 283-284].

A.Rona-Taş və B.A.Serebrennikov da Altay dillərinin qohumluğu problemindən bəhs etmişlər [101, 31-45; 116, 28-47; 119, 46-56]. Lakin onlar öz məqalələrində əsasən A.Şerbakın və L.Liqetinin gəldiyi nəticələrlə razılaşmışlar və bu səbəbdən skeptik altayşünasların Altay dilləri arasında genetik qohumluğun deyil, tipoloji uyğunluğun olması ideyasını müdafiə etmişlər.

XX əsrin 50-ci illərindən sonra altayşünaslıq nəzəriyyəsinin tərəfdarları getdikcə çoxalmışdır. Hətta 1958-ci ildə (25-28 iyun) Almaniyanın Mayns şəhərində Altayşünasların birinci beynəlxalq müşavirəsi keçirilmişdir. Həmin müşavirədə Daimi Beynəlxalq Altayşünaslıq Konqresi (ing. qısaca PİAK) təsis edilmişdir. Konqresin yaradılmasında əsas məqsəd Altay xalqlarının dili, ədəbiyyatı, mədəniyyəti, incəsənəti, tarixi, etnoqrafiyası və s. ilə bağlı dünya altayşünasları tərəfindən aparılmış tədqiqatların mərkəzləşdirilməsi olmuşdur. Birinci iclasın iştirakçıları altayşünaslıq problemləri ilə bağlı hər il toplaşmağı qərara almışlar [146, 149-153; 134, 129-133]. Qeyd edək ki, PİAK-ın 1986-cı il iclası Daşkənddə, 1993-cü il iclası isə Alma-Atada keçirilmişdir. Xarici ölkə dilçilərindən Y.Nemet, L.Liqeti, A.Rona-Taş (Macarıstan), M.Rəsənen, R.Aalto (Finlandiya), C.Klouson (Böyük Britaniya), N.Poppe, D.Şinor, K.Menqes (ABŞ), İ.Bensinq, G.Dörfer (Almaniya), keçmiş Sovet İttifaqının tanınmış dilçiləri N.A.Baskakov, A.N.Kononov, V.İ.Sinsius, A.M.Şerbak, L.P.Potapov PİAK-ın forumlarında yaxından iştirak etmişlər və hər biri müxtəlif

---

[1] Алтай дилляриндя грамматик ъинс категорийасынын яламятляри щаггында III фясилдя эениш сющбят ачаъаьыг.

illərdə təşkilatın baş mükafatı olan qızıl medala layiq görülmüşlər [151, 3-4]. Yeri gəlmişkən, maraqlı bir faktı da qeyd edək ki, PİAK-ın himninin sözləri və musiqisi görkəmli türkoloq dilçi N.A.Baskakova məxsusdur [151, 27-28]. Bundan başqa, Azərbaycan dilçilərindən Ə.Abdullayev (iki dəfə–1969-cu il Berlin, 1986-cı il Daşkənd), F.Zeynalov, Z.Budaqova, K.Abdullayev, A. Məmmədov və s. PİAK-ın sessiyalarında çıxış etmişlər [21, 22; 33, 73; 74].

# III FƏSİL
# ALTAY DİLLƏRİNİN QOHUMLUĞUNU SÜBUT EDƏN ƏSAS PRİNSİPLƏR

## 3.1.Qohumluq etno-kulturoloji dünyagörüşü səviyyəsində

Müşahidələr göstərir ki, Altay dillərinin qohumluğunu sübut edən əsas uyğunluqlar dilin bütün səviyyələrində (xüsusən morfoloji səviyyədə) özünü göstərir. Lakin biz dil səviyyələrinə nəzər salmazdan öncə, Altay xalqlarında ortaq səciyyə daşıyan mifoloji dünyagörüşə, folklor yaradıcılığındakı ümumi səciyyəli xüsusiyyətlərə və s. qısaca nəzər salmaq fikrindəyik. Çünki I fəsildə söylədiyimiz kimi, məhz bu zaman əldə edilmiş nəticələrlə müqayisəli-tarixi metod öz elmi mahiyyətini və praktiki əhəmiyyətini dolğunlaşdıra bilər.

Altay xalqları içərisində türk və monqol xalqlarının (əvvəlcədən qeyd edək ki, digər Altay xalqlarının dünyagörüşü etno-kulturoloji səviyyədə kifayət qədər öyrənilmədiyindən biz daha çox türk və monqol xalqlarına aid olan materiallara istinad edəcəyik) etnik birliyindən və qarşılıqlı əlaqələrindən bəhs edən əsatir və rəvayətlər, tarixi materiallar elmə çoxdan məlumdur. Məsələn, «Rəşidilər tarixi» əsərinin müəllifi qeyd edir ki, Yafətin (Nuh peyğəmbərin böyük oğlu) böyük oğlunun adı Türk olmuş və onu

həmişə «Yafətin oğlu» deyə çağırırmışlar. Türkün böyük oğlunun adı isə Əlicə, yaxud İlincə (müq. et: Əlincə qalası) xan olmuşdur. Əlicə xanın iki oğlu dünyaya gəlmişdir: Tatar və Moqqul (müq. et: Monqol). Uşaqlar böyüyəndən sonra Əlicə xan idarə etdiyi ərazini iki yerə bölmüşdür. Bir hissəyə Tatar, digərinə Moqqul başçılıq etmişdir. Daha sonralar onlar arasında misli görünməmiş müharibələr başlamış və beləliklə, iki böyük sülalə bir-birindən ayrılmışdır [140, XX].

Bundan sonra müəllif Oğuz xanın dünyaya gəlməsi və onun möcüzələri haqqında yazmışdır. Maraqlıdır ki, o, Oğuz xanı Moqqulun nəvəsi kimi təqdim etmişdir. Eyni zamanda burada müsəlmanlığın ideallaşdırılması aydın nəzərə çarpır: «… Moqqul xanın ölümündən sonra hakimiyyətə onun böyük oğlu Qara xan gəlir… Qara xanın baş hərəmindən oğlu dünyaya gəlir. Uşaq bir neçə gün süd yemir. Ana çox narahat olur. Nəhayət, bir gün uşaq dilə gələrək deyir: «Ana, sən müsəlmanlığı qəbul etməsən və ulu Tanrıya sitayiş etməsən, mən süd yeməyəcəyəm». Ana bu hadisədən çox qorxur və oğlunun da, özünün də öldürüləcəyindən ehtiyatlanaraq baş verənlər barədə heç kimə danışmır. Özü isə gizlincə müsəlmanlığı qəbul etdikdən sonra uşaq süd yeməyə başlayır… Moqqulların adətinə görə, uşağın bir yaşı tamam olanda Qaraxan böyük ziyafət təşkil edir (müq. et: «Kitabi-Dədə Qorqud» dastanında adqoyma mərasimləri üçün təşkil edilmiş ziyafətlər). Qara xan oğlunu qucağına alır və onun anasına müraciət edir: «Oğlumuza hansı adı verək?». Bu vaxt uşaq dil açaraq deyir: «Mənim adım Oğuzdur!» [140, XXI].

Bir məsələni xüsusilə qeyd etmək istəyirik ki, çox vaxt tədqiqatçılar türklərin əcdadı hesab edilən Oğuz xanla monqolların əcdadı olan Mode xanı eyniləşdirirlər. S.Çaqdurov yazır ki, «…bəzi

tarixçilərin fikrincə, türklərin əcdadı olan Oğuz xanla monqolların əcdadı Mode xan eyni adamdır» [136, 18]. N.Y.Biçurin bir sıra tarixi materiallara (o cümlədən «Şəcəreyi-tərakimə»yə) əsaslanaraq yazır ki, «Mode (yaxud Maodun -*T.Q.*) Asiya tarixində Qara xanın oğlu Oğuz xan kimi məşhurdur». A.N.Bernştem isə hesab edir ki, «Oğuz xanın etnik bioqrafiyası ilə Maodunun bioqrafiyası arasında oxşarlıq onlara bir real tarixi şəxsin iki təzahürü kimi baxmağa imkan verir» [Bax: 136: 19, 80]. Bundan başqa S.A.Tokarev buryatların ulu əcdadı hesab edilən əfsanəvi-mifik obraz Buxa-Noyan-baba («buğa-şahzadə-ata») ilə türkmənlərin və s. türk xalqlarının ulu əcdadı olan Oğuz xanı («buğa-şahzadə») müqayisə edərək göstərir ki, belə qarışıq obrazların mövcudluğu totemik əcdadlara inam arasındakı kəskin fərqi əsla aradan qaldırmır [133, 264].

Altay xalqlarının genetik qohumluğunu onların mifoloji dünyagörüşündə, rituallarında, inanclarında, folklor yaradıcılığında, kultlar sistemində və s. ardıcıl şəkildə izləmək mümkündür.

Sübut olunub ki, buddizmə və islam dininə qədər (şamanlığı da buraya əlavə etmək olar) kultlar (dini sitayiş obyektləri) Altay xalqlarının dünyagörüşündə əsas yeri tutmuşdur. Elmə çoxdan məlumdur ki, Altay xalqlarının əksəriyyətinin (xüsusilə türklər və monqolların) ilk tapınışı Tenqri (Teyri, Tenqir) olmuşdur. Göy Allahının adını (Gök Tenri) ifadə edən Tenqriyə sitayiş, ona ruhi bağlılıq türk və monqol xalqları üçün ortaq səciyyə daşıyır. Məhz bu ortaqlığın nəticəsidir ki, dil tədqiqatçıları *Tenqri* lekseminin hansı dilə mənsub olması məsələsində hələ də yekdil rəyə gələ bilməmişlər. Koreyalı professor Choi Han Woo daha maraqlı fikirlər irəli sürmüşdür. Onun fikrincə, koreyalılar vaxtilə Quzey Sibirdən Koreya yarımadasına köçmüş əski asiyalıların nəslidir və «…İlk kore kavmi konfederasyon devletlerinde görünen «şafak inancı» ve «Gök

Tanrı inancı» ilk kore devletlerinin Hyunq-nu, Tabğaç və Göktürk gibi eski Türk konfederasyon devletleri ilə yaxından alakalı olduğu ihtimalini kuvvetlendirir» [5: 27, 31].

Türklərin və monqolların tapındığı totemlər arasında qurd (canavar) obrazı xüsusilə geniş yayılmışdır. Tanınmış folklor tədqiqatçısı X.Koroğlu qeyd edir ki, «… Gök Buri («göy qurd») obrazı qədim ənənəyə malikdir. O, türk xalqlarında, o cümlədən oğuzlarda totemdir və türk-monqol xalqlarının, demək olar ki, bütün əfsanə və rəvayətlərində xatırlanır» [64, 106].

K.Məmmədov yazır: «… Balkan yarımadasından Koreya yarımadasının cənubuna qədər geniş bir ərazidə yayılmış və öz orijinallığı ilə seçilən qəbirüstü qoç və tısbağa heykəlləri Altay xalqlarının vahid dini dünyagörüşə malik olduqlarını göstərir» [14: 43].

Maral kultu («maral-göy», «maral-günəş») bir çox xalqlarda (Ural, Qafqaz, Paleoasiya, hind-Avropa) olduğu kimi Altay xalqlarının da mifik yaradıcılığında geniş yayılmışdır. İnanca görə, ilk dəfə maral göy Allahlarının yanından yerə enmişdir. Ancaq monqol və türk xalqlarında ortaq səciyyə daşıyan əks motiv mövcuddur. Kalmık, buryat, Altay, tuva və qazax əfsanələrinə görə, maral mifik ovçuların (kalm. *Kikdi Merqi*, bur. *Xuxedey Merqen*, Alt. *Koqol Mauman*) təqibindən qurtulmaq üçün göylərə qalxmış və Orion bürcünə (kalm. *Xurvn marl*, monq. *Qurban maral*, türk. *Üç mıymak*, qazax. *Üş arxar*-«üç maral») çevrilmişdir. Tədqiqatçıların fikrincə, «maral-ulu əcdad» motivi Altay, Sibir və Mərkəzi Asiya xalqlarının əsatir və rəvayətlərində çox dayanıqlı sistemlərdəndir [152].

Dünya xalqlarının kosmoqoniyasında dağ motivi müxtəlif mifoloji funksiyalara malikdir. Çox vaxt dağ dünya ağacının

transformasiyasının geniş yayılmış növü kimi çıxış edir. Dağ dünya obrazı kimi qəbul olunur. O, dünyanın oxu keçən mərkəzində yerləşir. Altay xalqlarında isə fərqli olaraq dünya dağı (*Sumer, Sumur, Sumbur*) dəmir dirək kimi təsvir olunur. Bu dağ kainatın mərkəzində yerləşir, yerlə göyü birləşdirir. Zirvəsi isə qütb ulduzuna qədər yüksəlir [153]. Altay xalqlarında dünya dağı ilə bağlı digər ortaq səciyyə ondan ibarətdir ki, digər xalqlardan fərqli olaraq onlarda real dağlar (məsələn, Altay, Qaf dağları və s.) mifikləşdirilmişdir.

Altay xalqlarının antropoloji quruluşunun eyniliyi də dəfələrlə sübut olunmuşdur. Fikrmizi daha da qüvvətləndirmək üçün maraqlı bir faktı qeyd edək ki, Əfqanıstanda türk mənşəli toponimləri tədqiq edən R.Eyvazovanın şifahi məlumatına görə, Əfqanıstanda yaşayan həzərələr (R.Eyvazovanın fikrincə, onlar türkdilli xəzərlərin nəslindəndir -*T.Q.*) monqollarla eyni antropoloji quruluşa, eyni məişətə malikdirlər. Onlar monqol və türk sözlərinin üstünlük təşkil etdiyi xüsusi dialektlərdə danışırlar [Bax: 6, 38].

Folklor tədqiqatçıları Altay xalqlarının epos yaradıcılığında çoxlu sayda müştərək süjetlərin mövcudluğunu qeyd edirlər. Məsələn, A.A.Aciyev qumuq folkloru ilə kalmıkların «Canqar» eposu arasındakı ortaq elementləri (xüsusilə qədim türk və monqol şer sistemində mövcud olan alliterasiyanı) bu xalqlar arasındakı genetik əlaqənin qədimliyi ilə izah edir. Monqol eposu «Geser»lə qumuq şifahi xalq yaradıcılığı arasındakı yaxınlıq isə türk-monqol folklorunun arxaik qatında bu xalqların folklor yaradıcılığının sonrakı inkişafına eyni dərəcədə təkan verən ümumiliyə əsaslanır [23, 35]. Bundan başqa, qədim türk eposu olan «Alpamış»ın da süjeti qədim türk və monqol xalqlarının mifologiyasından qaynaqlanmışdır [80, 62]. Q.O.Tudenov isə yazır ki, «… Altay dövründə türk və

monqol xalqlarının ulu əcdadlarının qarşılıqlı əlaqələri Mərkəzi Asiya və Cənubi Sibirdə folklor vəzninin ümumi ortaq əsasını yaratmışdır. Cənubi Sibirin türkdilli və monqoldilli xalqlarının nəğmə və eposlarında folklor poeziyasının bütün əsas ritmyaradan vasitələri mövcuddur: bəndlərin və ya beytlərin alliterasiyası, ritmik-sintaktik paralellik, qrammatik qafiyə (şerin sonunda söz və şəkilçilərin təkrarı və s.) …» [131, 111].

Təkcə şer yaradıcılığı deyil, folklor nəğmələrində də (məsələn, heyvanlara (dəvə, qoyun, at və s.) müraciətlə söylənmiş nəsihət nəğmələri. Azərbaycan folklorunda holavar və sayaçı sözlərinə uyğundur) türk və monqol xalqlarının ortaq səciyyə daşıyan motivlər çoxdur. B.B.Okonov qeyd edir ki, kalmıklarda heyvanlara müraciətlə söylənmiş nəsihət nəğmələri türklərin nəğmələrinin məzmununa çox yaxındır. Bundan başqa, tədqiqatçı göstərir ki, oyrot-kalmıklarda real prototip olan epik obraz *Şuna Batırın* (şərəfinə nəğmələr yaradılmış qəhrəman obrazıdır) adı bir çox türk və monqol xalqlarında geniş yayılmışdır. Bu ad Altaylarda *Şuna, Şunutı, Şonotı*, qırğızlarda və qazaxlarda *Sna Batır* və *Sunu-Mıttır*, buryatlarda *Şono Bator* kimi yayılmışdır [89, 106].

Bütün söylənənlərdən belə nəticəyə gəlmək olar ki, ortaq maddi-mənəvi mədəniyyət Altay xalqlarının qohumluğu fikrini qəti söyləməyə imkan verir.

### 3.2. Fonetik səviyyə

Biz bu yarımbaşlıqdan etibarən Altay dillərinin qohumluğunu sübut edən dil səviyyəsində əsas uyğunluqları ardıcıl olaraq müxtəlif dil səviyyələrində izləməyə çalışacağıq.

Altay dillərinin qohumluğu bu dillərin fonetik quruluşunda kifayət qədər əks olunmuşdur. Bunu ulu Altay dilinin fonemlər

sisteminin müasir Altay dillərinin fonemlər sistemi ilə uyğunluğuna əsaslanaraq söyləmək olar.

Saitlər. İlk hecadakı saitləri əsas götürməklə ulu Altay dilinin saitlər sistemini təxminən bu şəkildə qruplaşdırmaq olar:

**a(ā)* **ü(ǖ)* **ä*
**o(ō)* **e(ē)* **ö (ö)*
**u(ū)* **ï(ï)* **ı*

Göstərilən saitləri ayrı-ayrı qruplarda birləşən türk dillərinin, demək olar ki, hamısında (o cümlədən qədim türk dilində) izləmək mümkündür. Bu səslər xüsusi dəyişikliyə uğramadan pramonqol və müasir monqol dillərində də öz mövcudluğunu qoruyub saxlamışdır. Tunqus-mancur dillərində isə cüzi dəyişikliklər (məsələn, ilk hecalarda *o, ō, ö, ö* səslərinin az işlənilməsi, uzun saitlərin daha üstün mövqeyə malik olması və s.) müşahidə olunur. Məsələn:

**türk.:** tele., şor., saq. *aba*, T. türk. *abe* «ulu baba», xak. *abā* «böyük qardaş», noq. *abaj* «anaya, nənəyə müraciət»; qır. *ateke* «baba», tat. *etkej* «ata», çuv. *atē, ette*, Azərb., baş., qaz. *ata* «ata»; Alt. *bölö* «bacının uşaqları», baş. *bülä* «nəticə (nəvənin oğlu)», *büläsär* «nəticə (nəvənin qızı)», xak. *pöle* «xala uşaqları»; qaz. *egiz*, T. türk. *ekiz*, Azərb. *äkiz*, xak. *ikis*, yak. *igire, igiri* «əkiz, oxşar»; Azəb. *böjräk*, qaz. *büjrek*, türkm. *bovrek*, yak. *büör*, xak. *pǖre* «böyrək»; tat. *bozav*, qır. *muzō*, baş. *buzau*, Azərb. *buzov* , tuv. *bızā* «buzov», uyğ. *oγuz*, tat. *uγuz*, qaz. *uyz*, qırğ. *ūz*, Alt. *ūrak* «ağız (süd)» və s.;

**monq.:** kalm. *ēl*, bur., xalx. *ajl* «ailə, aul»; kalm., xalx., bur. *ūraq* «ağız (süd)»; kalm., bur. *sā*, bur. *hā* «sağmaq»; kalm. *böre*, xalx. *bör*, monq. *büqere* «böyrək», kalm. xalx., bur. *dǯorō*, qəd. monq. *dǯiroqa* «yorğa»; kalm. *bürǖ*, xalx. *bjarū*, bur. *burū*, qəd. monq. *biraqu* «buzov» və s.;

**tunq.-manc:** *delkin* «dalaq», *ukkun, kō-(n-)~kū-(n-)* «köks», *amŋa, amma* «ağız (orqan)», *gā<gaja<gara* «qol, budaq», *bilēn* «bilək», *dǯurugu* «ürək», *ogus//ovus//egus* «öküz» və s.

Sait səslərlə bağlı apardığımız müşahidələr göstərir ki, burada digər ortaq xüsusiyyətlər də mövcüddür. Məsələn, türk və monqol dillərində uzun və qısa saitlərin asanlıqla ayrılması, samitlərə nisbətən saitlərin daha zəngin səs keçidləri və s.

<u>Samitlər.</u> Altay dillərindəki samit səslərdən danışarkən öncə diqqəti xüsusi əhəmiyyət kəsb edən bir məsələyə yönəltmək istəyirik. Q.Ramstedt tədqiqatlarının birində türk və monqol dillərinin fonetik qanunlarından bəhs edərkən göstərmişdir ki, «z» və «ş» səsləri baxımından monqol dilləri türk dillərinə münasibətdə çuvaş dilindən heç nə ilə fərqlənmir [Bax: 4, 27]. Yəni türkcədəki «z» və «ş» səsləri çuvaş dilində mühafizə olunmayaraq, yerini monqolcada olduğu kimi «*r*» və «*l*» səslərinə vermişdir. Məsələn:

1. *z-r*

türk.: *eki<u>z</u>, egi<u>z</u>, ige<u>z</u>, iki<u>z</u>ek, ihi<u>z</u>* «ekiz»;

çuv.: *yege<u>r</u>* «cift», *yek<u>r</u>eş* «ekiz»;

monq.: *iki<u>r</u>e* «ekiz».

2. *ş-l*

türk.: *ta<u>ş</u>, da<u>ş</u>* «daş»;

çuv.: *ču<u>l</u>* «daş»;

monq.: *či<u>l</u>ağun* «daş».

Bütün bunları nəzərə alan Q.İ.Ramstedt sonda belə bir nəticəyə gəlmişdir ki, türkcədəki «z» və «ş» səsləri qədimdən mövcud olmayıb, monqol və çuvaş dillərində daha qədimdən mühafizə olunan «*r*» və «*l*» səslərindən törəmişdir [4, 27-30; 94, 112-113]. Məhz bu fikrə əsaslanaraq türk-çuvaş-monqol dillərinin qarşılıqlı münasibəti baxımından Altay dil ailəsinin diferensiasiyasını

bu istiqamətdə göstərmək olar: ulu Altay dili (*r* və *l* dili) ulu monqol (*r* və *l* dili) və ulu çuvaş-türk (*r* və *l* dili) dillərinə ayrılır. Ulu çuvaş-türk dili isə öz növbəsində qədim çuvaş (*r* və *l* dili) və qədim türk (*z* və *ş* dili) dilinə bölünür.

Maraqlıdır ki, Y.D.Polivanov türk və monqol dillərindəki rotasizmin (*z=r*) və lambdaizmin (*ş=l*) Koreya dilində də analogiyasını göstərmişdir:

1) türk. *š//* çuv., monq., manc. *l//* kor. *l//r*;

2) türk. *z//* çuv., monq., manc. *r//* kor. *l//r;*

3) türk. *l//* çuv., monq., manc. *l//* kor. *l//r;*

4) türk. *r//* çuv., monq., manc. *r//* kor. *l//r*.

Məsələn:

1. türk. *ş//* çuv., monq., manc. *r//* kor. *l//r*

türk.: **taš̱* «daş»;

çuv.: *čuḻ* «daş»;

monq.: *čiḻaϒun* «daş»;

manc.: *ǯoḻo* «daş»;

kor.: *toḻ* «daş»

2. türk. *z//* çuv., monq., manc.*r// kor. l//r*

türk.: **ya:ẕ* «yaz»;

çuv. *suṟ* «yaz»;

monq.: *niṟai* «yeni doğulmuş»;

manc: *niyaṟxun* «yaşıl, təzə-tər»;

kor. *n λ̓ṟam* (← **njerλm*) «yay» və s. [93, 161-162].

Bütün söylənənləri nəzərə alaraq bir daha təsdiqləyirik ki, çuvaş dili türk dilləri içərisində ulu Altay dilindən gələn ilkin xüsusiyyətləri daha çox saxladığından türk dilləri ilə digər Altay dilləri arasında aralıq mövqe tutur və ulu türk dilinin bərpa olunmasında əvəzsiz materiallara malikdir.

Altay dillərinin tanınmış tədqiqatçısı S.A.Starostin Q.Ramstedtin, N.Poppenin, C.Stritin və s. mülahizələrinə əsaslanaraq ulu Altay dilinin samit səslər sistemini bərpa edərək aşağıdakı kimi qruplaşdırmışdır (samit səslər üzərindəki müşahidələrimiz bu rekonstruksiyada öz əksini tam olaraq tapdığından S.A.Starostinin bərpasını ən uğurlu bərpa hesab edirik):

*p$^{1}$, *p, *b, *m, *-w-, *t$^{1}$, *t, *d, *n, *n$^{1}$, *-r-, *-r$_{1}$-,*l, *-l$_{1}$-, *k$^{1}$, *k, *g, *č$^{1}$, *č, *ǯ, *ń, *s

S.A.Starostin bu səsləri pratürk, pramonqol, pratunqus-mancur, orta Koreya və prayapon dillərində izləyərək Altay dillərinin fonetik səviyyədə qohum olmasını söyləməyə imkan verən tutarlı nəticələr əldə etmişdir. Məsələn, ulu altay dilində bərpa olunmuş samit səslər uyğun səs keçidləri ilə bütün qədim Altay dillərində müşahidə olunur [120, 104].

### 3. 3. Morfoloji səviyyə

Məlumdur ki, morfologiya sahəsində müqayisə üçün əsas etibarilə sözdəyişdirici şəkilçilərdən istifadə edilir, çünki dilin morfoloji mexanizmini məhz həmin şəkilçilər əks etdirir [3, 218-219].

Monqol, türk və tunqus-mancur dillərində genetik baxımdan ümumi olan əsas sözdəyişdirici kateqoriyalar bunlardır: 1) obyekt-predikat münasibətlərini ifadə edən hal kateqoriyası; 2) subyekt və predikatın sintaktik münasibətini ifadə edən şəxs kateqoriyası; 3) atributiv münasibət ifadə edən mənsubiyyət kateqoriyası.

Hal kateqoriyası. Altay dilləri ilə məşğul olan tədqiqatçıların demək olar ki, hamısı (Q.İ.Ramstedt, V.L.Kotviç, O.P.Sunik, V.İ.Sinsius, N.A.Baskakov, A.P.Dulzon və s.) bu dillərin hallanma sistemində fövqəladə forma yaxınlığı olduğu-nu qeyd etmişlər.

1. Adlıq hal bütün Altay dillərində söz əsası ilə üst-üstə düşür.

2. Yiyəlik hal:

türk. _-nyŋ-nyn,-yn,-ə$^1$n_;

monq. _*-nun>-nu$^n$>-nu; *-nyŋ>-nįn>-ni: ger_ «ev»_-ger-ün_ «evin»;

tunq. _-i, -ni_: _mafa_ «ata»_-mafa-i_ «atanın»; _wang_ «hökmdar»-_wang-ni_ «hökmdarın»; _bi_ «mən»_-min_ «mənim»;

korey. _-n, -ai, - įi, - i: hai_ «gün»_-hai-n_ «günün»; _saram_ «insan» - _saram-įi_ «insanın»; _na_ «mən»_-na-i_ «mənim».

Altay dillərində yiyəlik hal formasından adyektiv _-ki_ sonluğunun köməyi ilə müstəqil sifətlər yaranır:

türk. _-niki_; _aγa-niki_ «qardaşımınkı, qardaşıma mənsub olan»;

monq. _-jinki_: _aqa-jinki_ «qardaşımınkı»;

tunq. _-ŋi_, - _ŋni: aka-ŋi~aka-ŋni_ «qardaşımınkı».

Bəzi Altay dillərində (xüsusilə monqol dilində) yiyəlik hal digər hallar üçün ilkin forma rolunu oynayır. Məsələn:

türk. (uyğ.). _biz-in-gä_ «bizə» (yönlük hal);

monq. (kalm.). _χān-ä-də_ «xanda» (yerlik hal);

korey. _saram-įi-ge_ «insanda» (yerlik hal).

Altay dillərinin əksəriyyətində yiyəlik halla düzəlmiş tipik konstruksiyalı söz birləşmələri mövcuddur:

türk. (uyğ.). _-qaγan oγlu_ «şahzadə» _-qaγan-yŋ oγlu_ «xaqanın oğlu»;

monq. (kalm.). _-χān χöwǖn_ «şahzadə»; _-χān-i χöwǖn_ «xaqanın oğlu» [26, 64; 99, 33-36].

3. Təsirlik hal:

türk. _-y, -i, -ny_ (qədim uyğur dilində mövcud olmuş _-yγ, -γ_): _sän-sän-i_; _bu-muni-y_ (qədim türk. _buny_); _biz-biz-ni_; _daγ-daγ-y_; tat.

*tau* «dağ» -*tau-ny* «dağı»; *üy* «ev»-*üj-ni* «evi». Çuvaş dilində təsirlik hal şəkilçiləri yönlük hal şəkilçilərinə (-*a,* - *ja,* - *na*) uyğun gəlir; monq. - *i* (samit səslərdən sonra), -*ji* (sait səslərdən sonra): *gar* «əl»-*gari-i* «əli»; *morin* «at»-*morin-i* «atı; *aqa* «böyük qardaş» -*aqa-ji* «böyük qardaşı»; *dalai* «dəniz» -*dalai-ji* «dənizi»;

tunq. -*a,* -*ja*<*i* : *mu-je* «suyu»; *mo-ja* «ağacı», eyni zamanda - *ba(-pa), -wa, -ma*: *oron-mo* «maralı» - cəmdə *oror-wo, oror-bo*; *hunāt-pa* «qızı» - cəm halda *hunil-ba, hunil-wa* və s.;

korey. -*į,* -*i,* -*ri* (şimali korey.), -įl, -il, -ril (cənubi korey.): *mun* «qapı»-*mun-u* (şim. korey.)-*mun-il* (cən. korey.) «qapını» və s. [26, 64; 99, 36-39].

4. Yönlük hal:

türk. -*a,* - *ga(- ka),* - *γa(-γar,* - *γaru),* - *ja*. Məsələn, qədim türk. *taγ* -*qa* «dağa»; çuv. *tə$^{1}$v-a*, tat., qaz., qır., tele. *tau-γa*; türk. *daγ-a*; qədim türk. *qaγan-qa* «xaqana», çuv. *χun-a, χon-a*; *maŋ-a* «mənə», *saŋ-a* «sənə»; Alt. *an-γar* «ona», *mun-γar* «buna»; qədim türk. *baŋaru* «mənə»;

monq. ilkin forma-*a*; *gaǯar-a* «torpağa, yerə», *dotur-a* «içəriyə, daxilə», *deger-e* «yuxarıya».-*a* şəkilçisi hal-hazırda ancaq qoşmalarda və bəzi fel formalarında müşahidə olunur. Yönlük halla birlikdə yerlik hal şəkilçisindən -*da*~-*du* istifadə olunur.

tunq. yönlük hal artıq məsuldar deyildir. Onun əvəzinə -*ja* «tərəf» qoşması işlənir. Bu qoşma qədim türk dilində də işlənmişdir: yara-ya «şimala» və s. [26, 65; 99, 39-42].

5. Yerlik (ablativ) və çıxışlıq hal:

türk. -*da,-dan,-din,-daŋ*: qədim türk. *oγuz-da* «oğuzda» və «oğuzdan», qədim əlyazmalarda *oγuz-da-jan, oγuz-da-ńan, oγuz-da-dan* «oğuzlardan (= oğuzlarla)»; -*da-jan*>-*dan-dan*> çıxışlıq hal şəkilçisi - *dan*;

monq. yerlik və çıxışlıq halda *-da (-ta), -du (-tu). -de (-te), -dü (-tü), -da* zərflərlə və qoşmalarla, *-du* isə isimlərlə işlənir. Yazılı dildə eyni zamanda *-dur* şəkilçisi işlənir. Məsələn: *tengri* «göy, səma»–*tengri-dür, tengri-dü, tengri-de* «göydə, səmada»;

tunq.-manc. *-du, -tu, -de; ǯū-du* «evdə», *lamu-du* «dənizdə» və s.;

Koreya dilində bu halın xüsusi qrammatik forması yoxdur. Bu mənada obyektin yerləşdiyi yeri bildirən *tąj* «yer» sözü işlədilir. Məsələn: *je tąj* «burada», *če tąj* «orada» və s.

Türk və monqol dillərində obyektin yerləşdiyi yeri bildirən ümumi mürəkkəb şəkilçi (*-daki*) mövcuddur. Həmin şəkilçi yerlik hal-*da,-de* şəkilçisi ilə münasibət bildirən-*ki* şəkilçisinin birləşməsindən yaranmışdır. Məs.; türk. *üj-deki*, monq. *der-tek* «evdəki, evdə yerləşən» və s. [26, 65; 99, 42-44].

6. Dativ hal:

Bu hal türk, monqol və Koreya dillərində özünü daha aydın surətdə göstərir. Direktiv hal əsasən istiqamət mənasını bildirir («hara?, haraya?») və bu baxımdan istiqamət halı da (lativ, prolativ) adlana bilər.

türk. *-ru, -rü*: qədim türk. *äbim-rü* «evim-ə», *bä-rü* «bura, buraya», *a-ru* «ora, oraya», uyğ. *ki-rü<*kä-rü* «geriyə, o yana, uzağa»;

Bu şəkilçi yönlük haldan sonra geniş işlənmə dairəsinə malik olmuşdur. *-γaru* şəkilçisi isə hətta produktiv şəkilçi keyfiyyətində işlənmişdir*: qaγan-γu* «xaqana», *biz-gärü* «bizim evə», *taš-garu, taš-γaru* «bayıra», *ič-kärü, ič-gärü* «içəriyə», *il-gärü* «irəliyə», *jo-γaru* «yuxarıya» və s;

monq. *-ru, -rū (-uru)* şəkilçilərinə daha çox dialektlərdə rast gəlmək olar: xalx. *modo-rū* «meşəyə, meşə istiqamətində», *gol-rū,*

*gol-urū* «çaya; ortaya, içəriyə», *qaga-ru~qaru<kalm. χār-ān* (qayıdış şəkilçisi ilə) «hara, haraya»; monq. *ina-ru* (=*inagsi*)>kalm. *nārān* «buraya» və s.;

Koreya dilində direktiv hal qədimdən müxtəlif formalarda təzahür etmişdir. Belə ki, bu hal cənubi Koreya dilində *-ro*, şimali Koreya dilində *-ru (-rį), -įllį (-įlį)* şəkilçiləri vasitəsilə yaranır. Həmin şəkilçilər də *-ru~rü* şəkilçilərindən düzəlmiş və istiqamət mənası bildirmişdir: *sanį-ro* «dağlar boyunca, dağlardan», şim.korey. *sanį-ru, sanįrį; čibį-ro* «evə, ev istiqamətində», şim. korey. *čibu-ru*; *allo* «aşağı, aşağıya», cən. korey. *mullo* «suya, sudan, su ilə», şim. korey. *mullu, muru-ru* «suya» və *mur-įllį, mur-ullį* «suya, sudan, su vasitəsilə» [26, 65; 99, 44-46; 65, 181-194].

Yeri gəlmişkən qeyd edək ki, A.P.Dulzon türk, monqol və tunqus-mancur dillərindəki qədim hal sistemini Yenisey dillərindəki (Yenisey dilləri dedikdə A.P.Dulzon XVIII əsrin birinci yarısından Sibirdə, Yenisey çayının hövzəsində yaşayan və qohum dillərdə danışan beş xalqın (arinlərin, assanların, imbatların (ketlərin), kottların və pumpokolların) dilini nəzərdə tutur [42, 79].) Həmin qrammatik kateqoriya ilə müqayisə edərək o, belə qənaətə gəlmişdir ki, hal şəkilçiləri baxımından Altay dillərinin Yenisey dilləri ilə ümumiliyi onların uzaq qohumluğunu sübut edən əsas faktlardan biridir [43, 60-63].

Qrammatik cins kateqoriyası. Altay dillərinin qohumluğundan bəhs edən tədqiqatçıların, demək olar ki, hamısı bu dillər üçün ortaq səciyyə daşıyan xüsusiyyətlərdən biri kimi qrammatik cinsin yoxluğunu qeyd etmişlər. Lakin monqol dilinin qrammatik quruluşu ilə yaxından tanış olarkən məlum olur ki, bu dildə nə vaxtsa mövcud olmuş qrammatik cinsin izləri vardır. Məhs

buna görə də biz bu məsələnin üzərində geniş dayanmaq qərarına gəldik.

B.X.Todayeva yazır ki, müasir xalxa-monqol dilində, eləcə də digər monqol dillərində qrammatik cins yoxdur. Adətən cins anlamı leksik yolla fərqləndirilir. Məsələn:

*er*-kişi *em*-qadın

*ečeq*-ata *ex*-ana

*xüü*-oğul *oxin*-qız

*ax*-böyük qardaş *eqč*-bacı

Lakin heyvanların (qadın cinsində) yaşını və rəngini bildirərkən müəyyən şəkilçilərdən istifadə olunur. Məsələn, rəng bildirən -*qčin* şəkilçisi:

*bor*-boz - *boro-qčin*-boz (dişi ayğırın rəngi)

*ulaan*-qırmızı, qonur, boz - *ulaan-qčin*-qonur (dişi inəyin rəngi)

Yaş bildirən (qadın cinsində)-*j* şəkilçisi:

*qunan*-üçillik - *qun-j*-üçillik (qadın cinsində)

*dönön*-dördillik - *dön-j*-dördillik (qadın cinsində) [132, 50].

N.Poppe də bəzi şəkilçilərin monqol dilində qrammatik cins kateqoriyasını ifadə etdiyini bildirmişdir. Məsələn:

1. -*ğui*. Funksiyası dişilik bildirən isimlər yaratmaqdır:

*kudu-ğui* (<*kudağui*) «qayınana»<*kuda* «qayınata»

2. -*kan/-ken*. Funksiyası kiçiltmə, bəzən dişilik ifadə edən isimlər yaratmaqdır:

*kara-kan* «qaracıq» < *kar-a* «qara»

(kiçik və ya sevimli heyvan balalarına verilən ad)

*ulağa-kan* «alcıq, qırmızıcıq» < *ulağan* «al, qırmızı»

(sevimli, kiçik nəsnə, məsələn, çiçək)

*nayi-kan* «şahzadə qız» < *noyan* «şahzadə oğlan»

*keü-ken* «qız» < *keü* «oğlan»

3. *-cin*. Funksiyası dişilik ifadə edən isimlər yapmaqdır:

*moŋğol-cin* «monqol qadın» < *moŋğol* «monqol (kişi)»

*ğuna-cin* «üç yaşındakı dişi» < *ğunan* «üç yaşındakı erkək» [15, 47-48]

Monqol dillərinin tanınmış tədqiqatçısı olan Q.D.Sanjeyev isə «Altayşünaslıqda müqayisəli-tarixi və tipoloji tədqiqatlar» adlı məqaləsində XIII əsr monqol abidələrində qrammatik cinsin mövcudluğundan bəhs etmişdir (bu barədə II fəsildə söhbət açmışdıq) [111, 88].

Qrammatik cins kateqoriyası baxımından türk dilləri üzərində apardığımız araşdırmalar kifayət qədər maraq doğurur.

Türk dillərində qrammatik cins kateqoriyası haqqında ayrı-ayrı türkoloqlar mülahizələr söyləmişlər. Məsələn, A. N. Kononov «Müasir türk ədəbi dilinin qrammatikası» əsərində türk dilində qrammatik cinsin leksik və semantik yolla yanaşı morfoloji yolla da ifadə olunduğunu qeyd etmişdir. Məsələn, I şəxsin təkinin mənsubiyyət şəkilçisi olan *-ım*$^4$-ın *han, bek~bik//beğ* sözlərinə artırılaraq qadın cinsi bildirən sözlər yaradır: *hanım* «xanın arvadı, xanım» *beküm~biküm//beğüm* «bəyin arvadı, bəyim».

*Han* və *bek//beğ* sözlərinin qadın cinsində olan digər formaları müxtəlif türk dillərində geniş yayılmışdır: *hanike, hanış* «xanın arvadı, xanın qızı», *biyke, biykeş* «baldız, ərin bacısı».

Bundan sonra A.N.Kononov aşağıdakı şəkilçilər vasitəsilə türk dillərində qrammatik cinsin yarandığını göstərmişdir:

-*ça/-çe*: *ağa* «böyük qardaş» - *ağça* «xanım»

*beçe//biçe(<biçe<beğçe<bekçe)* «qadın, ev sahibəsi»

*koda* «qayınata» - *kodaça* «qayınana»

-*çin*: *burçin* «dişi maral balası»

*dünən* «4 yaşında erkək ayğır balası» -*dünə-jen* «4 yaşında dişi bala»

*konan* «3 yaşında erkək ayğır balası» - *kona-jın* «3 yaşında dişi bala»

-*sar/-sər* (başqırd dilində): *eyən* «nəvə (oğlan)» - *eyən-sər* «nəvə (qız)»

*bülə* «nəvənin oğlu (nəticə)» - *bülə-sər* «nəvənin qızı» [58, 66].

A.N.Kononov «Müasir özbək ədəbi dilinin qrammatikası» əsərində yenidən bu məsələyə qayıtmış və cins yaradan şəkilçi morfemləri aşağıdakı şəkildə göstərmişdir:

1.-*im; xon-im* «xanım».

2.-*ça;(<çağ<çanq)//-a<ka(<-koқ) burça>bura//bek~buka ~ buyka* «bəy arvadı, bəy qızı».

3.-*çi; eqaçi* «böyük bacı» (*eqa~aka* «böyük qardaş»)

4.-*(a)ç; bekaç//bikaç (<bekaç*$\frac{a}{i}$ «bəy qızı, xanım»*)*

5.-*çin/jin/jik; borçin* «ördək (fərə, dişi)» və s.

Maraqlıdır ki, A.N.Kononov əvvəlkindən fərqli olaraq bu dəfə həmin şəkilçiləri (-*im*-dən başqa) kiçiltmə şəkilçiləri hesab etmişdir [59, 71-72].

Yeri gəlmişkən qeyd edək ki, N.K.Dmitriyev də «Azərbaycan dilində qrammatik cins kateqoriyası haqqında» adlı yazısında Azərbaycan dilində qrammatik cins formantlarının mövcudluğundan bəhs etmişdir. O göstərmişdir ki, *xanım, bəyim, bəgim* sözlərindəki -*ım, -im* şəkilçiləri bu mövqedə I şəxsin təkinin mənsubiyyət şəkilçiləri yox, qadın cinsinin göstəriciləridir. Yəni həmin sözlər «mənim xanım», «mənim bəyim» anlamında deyil, «xan arvadı», «bəy arvadı» anlamındadır. N.K.Dmitriyev həmin məqaləsində -*i*

(*eş-i* «ərin arvada müraciəti» – Azərbaycan dilinin Qazax dialektində, Bakı kəndlərinin birində və özbək dilinin Qarabulaq dialektində işlənir), *-ça*, *-çin* (N.K.Dmitriyevin fikrincə, *bildirçin, sığırçın*, *göyərçin* və s. sözlər əvvəllər fərə, dişi quş anlamını ifadə etmişlər, *məkərçin* «dişi donuz») şəkilçilərinin cins kateqoriyası ifadə etdiyini vurğulamışdır [41, 353-354]. *-çin* şəkilçisi ilə bağlı bir faktı da qeyd edək ki, Q.Qasımbəyli rus dilində olan *korşun* sözündəki -*şun* elementinin türk dillərindən alındığını göstərmişdir. Analoji olaraq E. Quliyev də *-lan* şəkilçi morfeminin rus dilinə (*o-lenğ, tö-lenğ*) türk dillərindən (*ars-lan, qap-lan, top-lan, tər-lan və s.*) keçdiyini qeyd etmişdir. [Bax: 68, 47].

L.A.Pokrovskaya türk dillərindəki qohumluq terminlərindən bəhs edərkən *-sar//-sər; ğıy//ğay; -ça//-çi* şəkilçilərinin qrammatik cins göstəricisi olduğunu göstərmiş, bunların hamısının monqol dilindən alınma olduğunu və alındığı dildə kiçiltmə mənasını ifadə etdiyini bildirmişdir [91, 79-80].

Türk dillərinin qədim lüğətləri üzərində apardığımız müşahidələrdən məlum oldu ki, həmin şəkilçilər türk dillərində də qrammatik cins kateqoriyasını ifadə edir. Məsələn, V.V.Radlovun lüğətinə diqqət yetirək:

*aɣaça* - «qadın» [96, 150-151].

*borçin* - «1. ördək (fərə, dişi); 2. maral (dişi)» [98, 1666].

*bikä* - «1. xanım, qadın; 2. qızlara müraciət» [98, 1739].

*bikäç/biqäç* - «1. qız; 2. gəlin~*bikäçla* - «gəlin getmək»» [98,1739].

«Türk dillərinin etimoloji lüğəti»ndə də bu tip sözlərə rast gəlmək olar:

*biyke/bu:ke/biqe; biyçe/biçä; biykeş/bikäç* – «bəy arvadı, sahibə» [114, 134-135].

*aƔačœ, aƔičɛ* «qadın, xanım» [113, 71].

*eqeč* -«1. böyük bacı; 2. ağıllı qız» [113, 223].

Qeyd edək ki, qadın anlamı ifadə edən *aƔača, burçın* «fərə, dişi ördək» sözləri Ə.Nəvainin dilində də qeydə alınmışdır [32, 42; 20, 123]. Başqa bir misal, V.Zahidoğlu «Kitabi-Dədə Qorqud»un dilindəki *bozac* sözünün «dişi» anlamında olmasını (*bozac turğay* – «fərə, dişi torağay») tutarlı dəlillərlə sübut etmişdir [19: 11]. Özbək dilinin şivələrində qadın cinsinə aid olan *kudača/kudäčä* «ər və ya arvadın gənc qohumu», *biykäč/biykäš* «ərin və ya arvadın kiçik bacısı» sözləri indi də işlənir [18: 337, 350].

Cins kateqoriyası tunqus-mancur dillərində də özünü göstərir:

*boro* «boz (rəng)» - *borotčon* - boz (dişi marala aid) [121, 96].

*beye* «insan» - *beye-qen* - «1. qız; 2. nikahsız doğulan qız» [121,122].

*qiv* «1. silkələnmək (heyvanlara aid); 2. buynuz atmaq (marala aid)» - *qivčen* «keçi (dişi), cüyür» [121, 148].

*kuda* «qayınata» - *kodoƔoy* «qayınana» [121, 423].

Bir şeyi xüsusilə vurğulamaq istəyirik ki, bəzi tədqiqatçılar türk və tunqus-mancur dillərindəki cins kateqoriyasının formantı olan şəkilçilərin əksəriyyətinin monqol dilindən alındığını (monqol dilində bu şəkilçilər kiçiltmə mənası ifadə edir) qeyd etmişlər. Məsələn, L.A.Pokrovskaya başqırd dilində cins kateqoriyasının formantı olan *-sar//-sər* şəkilçisinin (*eyän* «nəvə (oğlan)»–*eyänsär* «nəvə (qız)»; *tıua* «nəticə (oğlan)»–*tıuasar* «nəticə (qız)»; *bülə* «ögey qardaş»–*büləsär* «ögey bacı» və s. sözlərdəki) monqol dilindən alındığını və həmin şəkilçinin mənsub olduğu dildə kiçiltmə mənası ifadə etdiyini göstərmişdir [91, 79-80]. Lakin Altay dillərinin

(o cümlədən, monqol dillərinin) görkəmli tədqiqtaçısı N.Poppe *-sar/-ser* şəkilçisinin monqol dilində kiçiltmə yox, inkarlıq ifadə etdiyini qeyd etmişdir:

*keüser* «sonsuz qadın» < *keü* «oğul» [15, 50].

M.R.Fedotov isə göstərmişdir ki, *-sar/-ser* (qədim türk dilində *-sız*$^{4}$, *-saz*$^{2}$) şəkilçisi Altay, şor, xakas, tuvin, yakut, tofalar dillərindən başqa digər türk dillərində inkarlığı (məhrumiyyəti) ifadə edir [135, 15-16]. Deməli, cins kateqoriyasını əmələ gətirən *-sar/-ser* və Altay dillərində inkarlığı ifadə edən *–sar/-ser/-säz/-sız* (r~z) başqa-başqa şəkilçilərdir.

Bütün söylənilənlər və hər üç dilin materialları üzərində apardığımız müşahidələr deməyə əsas verir ki, ulu Altay dilində nə vaxtsa cins kateqoriyası olmuşdur. Bu kateqoriya ulu Altay dilinin diferensiasiyasından sonra da müəyyən müddət mövcudluğunu qoruyub saxlamışdır.

Fikrimizcə, qrammatik cins kateqoriyasının formantı olan və Altay dillərində özünü göstərən *-ča*$^{2}$*/-čin*$^{4}$*/-ǯin/-(a)*$^{2}$*č/-sar*$^{2}$ *və -ğay*$^{2}$*/-ğıy*$^{4}$*/-qay*$^{2}$*/-qan*$^{2}$*/-kaç*$^{2}$*/-käş*$^{2}$*/-ka* şəkilçiləri eyni maddi əsasdan *-*ça* və *-*ka* morfemlərindən yaranmışdır. Həmin morfemlərin isə Altay dillərində ta qədimdən geniş yayılmış **ačä//ečä//eqe//eke//ekä//eka* «süd verən; ana; qadın; bacı; xala, bibi» sözündən törədiyi qənaətindəyik.

Diqqəti digər bir məsələyə yönəltmək istəyirik ki, qeyd etdiyimiz şəkilçilər sonradan hər üç dildə omonim şəkilçilərə çevrilmişlər. Belə ki, *-ča/-čä*; *-ka/-kan; (a)č* şəkilçiləri həm cins kateqoriyasının formantı, həm də kiçiltmə, əzizləmə mənası ifadə edən şəkilçilər mövqeyində çıxış edirlər. Yəni həmin şəkilçilər sözə artırılaraq mənanı dəyişib, cinsi dəyişmirlərsə, kiçiltmə, əzizləmə,

sözə artırılaraq məna ilə bərabər cinsi də dəyişirlərsə, qrammatik cins formantı olurlar. Məsələn:

türk.: *eke* «ana» - *eke-č* «böyük bacı» [113, 223].

*äpä/apa* «böyük bacı» - *äpä-čä* «gəlin»; *äbä-čä* «ögey bacı» [18, 333].

*ana* «ana» - *ana-c* «ana (əzizləmə mənasında)» [40, 43].

*ekä* «böyük bacı» - *ekä-č* «bacı (əzizləmə mənasında)» [40,167].

monq.: *kara* «qara» - *kara-kan* «qaracıq (kiçik heyvan balası)»

*ulağan* «qırmızı, al» - *ulağa-kan* «qırmızı rəngli kiçik əşya» [15, 47].

Göstərilən misallarda *-ča/-(a)č* və *-kan/-ka* şəkilçiləri kiçiltmə anlamını ifadə edirlər.

Türk.: *aϒa* «böyük qardaş» - *aϒa-ča* «qadın» [32, 42], *ağ-ča* «xanım» [58, 66].

*biy* «bəy» - *biy-če* «bəy arvadı, xanım» [114, 135].

*koda* «qayınata» - *koda-ča* «qayınana» [58, 66].

*kuda* - *kuda-ğay* «qayınana» [91, 80].

*tıua* «nəvə (oğlan)» - *tıua-sar* «nəvə (qız)» [91, 79].

*aba* «böyük qardaş» [91, 30] - *ava-qay/avı-qay* «xanım» [129, 45];

monq.: *kuda* «qayınata» - *kudu-ğai(<kuda-ğai)* «qayınana»

*noyan* «şahzadə oğlan» - *noiy-kan* «şahzadə qız»

*keü* «oğlan» - *keü-ken* «qız» [15, 47-48];

tunq.-manc.: *beye* «insan, kişi» - *beye-qen* «qız, qadın», *kuda-kodo-ϒoy* «qayıana» [121,423].

Bu misallardakı şəkilçilər isə sırf cins kateqoriyasının formantlarıdır. Fikrimizcə, tədqiqatçıların türk və tunqus-mancur dillərindəki cins ifadə edən şəkilçilərin monqol dilindəki əzizləmə, kiçiltmə şəkilçilərindən alındığını qeyd etməsinin səbəbi şəkilçilərin omonimlik keyfiyyətini nəzərə almamasıdır. Digər tərəfdən, hesab edirik ki, həmin şəkilçilər Altay dillərində (daha doğrusu, ulu dillərdə) ilk olaraq cins kateqoriyasını ifadə etmişdir. Kiçiltmə, əzizləmə anlamını ifadə etmə sonrakı hadisədir və müasir dillərdəki -*ča*$^{2}$/-*cıq*$^{4}$ kiçiltmə şəkilçiləri cins formantlarından törəmişdir: -*ča*$^{2}$~-*čan*$^{2}$~-*čin*$^{4}$~-*čiŋ*$^{4}$~-*čıq*$^{4}$ (bu şəkilçilər də türk dillərindən slavyan dillərinə (xüsusən rus dilinə) keçmişdir). Çünki müasir Altay dillərində özünü göstərən cins kateqoriyasının izləri belə bir qənaətə gəlməyə əsas verir ki, Altay dil ailəsinə daxil olan protodillərdə əvvəlcə cins kateqoriası mövcud olmuşdur. Lakin dilin qənaət prinsipinə və çoxvariantlılıqdan azad olma meylinə əsasən cins kateqoriyası getdikcə zəifləmiş, hal-hazırda relikt formada qalmışdır. Bu mövqe zəifləməsindən sonra kiçiltmə, əzizləmə anlamı yaranmış (qadına xas olan zəiflik və zəriflik cins ifadəsindən kiçiltməyə köçürülmüşdür) və cinsə nisbətən daha yüksək mövqe qazanmışdır.

Yeri gəlmişkən, cins kateqoriyasından azad olma meylini digər dillərdə də izləmək olar. Məsələn, müasir fars dilində bu kateqoriya tamamilə yoxdur (qədim fars dilində olmuşdur), german qrupuna daxil olan ingilis dilində isə (həmin qrupa daxil olan alman dilindən fərqli olaraq) tamamilə zəifləmişdir.

Əldə etdiyimiz nəticələrə əsasən, hesab edirik ki, müasir qaqauz dilindəki cins formantı olan -*ka* şəkilçisi slavyan dillərindən alınmamış (əksinə, bu şəkilçi Altay dillərindən slavyan dillərinə keçmişdir. Belə bir keçid *xan-şa* «xan arvadı», *bek-şa* «bəy arvadı» (-*ça*~*şa*) sözlərində də özünü göstərir), sadəcə öz mövcudluğunu

saxlamışdır. Buna əsas səbəb kimi qaqauz dilinin slavyan və roman dilləri ilə əhatə olunması, onların təsiri altında cins kateqoriyasından azad ola bilməməsidir.

Beləliklə, söylənilənləri ümumiləşdirərək belə bir qənaətə gəlirik ki, Altay dillərində nə vaxtsa cins kateqoriyası olmuşdur. Dilin daxili inkişaf qanunları nəticəsində bu kateqoriya getdikcə zəifləmiş, müasir dillərin leksikasında yalnız izləri qalmışdır. Bütün bunları nəzərə alaraq cins kateqoriyasının yoxluğunu deyil, ulu Altay dillərində cins kateqoriyasının mövcudluğunu və bu ailəyə daxil olan dillərdə (türk, monqol və tunqus-mancur dillərində) eyni zamanda və eyni səbəbdən aradan çıxmasını Altay dilləri üçün ortaq qrammatik əlamət olması fikrini irəli sürürük.

<u>Şəxs və mənsubiyyət kateqoriyaları.</u> Altay dillərində bilavasitə əvəzliklə bağlı olan şəxs və mənsubiyyət kateqoriyalarını Q.İ.Ramstedt və V.L.Kotviç daha ətraflı tədqiq etmişlər. Türk, monqol və tunqus-mancur dillərində geniş istifadə dairəsinə malik olan şəxs və mənsubiyyət şəkilçiləri aşağıdakılardır:

**Təkdə**

**I şəxs**

| | | |
|---|---|---|
| **Türk** | şəxs | *-man, -myn, -m, -n* |
| | mənsubiyyət | *-m* |
| **Monqol** | şəxs | *-bi, -b, -m, -w* |
| | mənsubiyyət | *-min, -mni, -m* |
| **Tunqus - Mancur** | məxs | *-w, -mi, -i, -bi, -m* |
| | mənsubiyyət | *-w, -f, -m, -i, -bi, -mi, -u, -mu* |

Göründüyü kimi, bu şəkilçilərin demək olar ki, hamısı I şəxsin təkindən (türk., monq., tunq. -manc. **min*) törəmişdir. Q.Ramstedtin də fikrincə, Altay dilləri üçün I şəxsin təkinin praforması **min* əvəzliyidir. Bu forma yalnız türk dillərində qalmışdır və qüvvətli vurğunun təsiri altında *män* formasına çevrilmişdir. *n* samitinin düşməsi nəticəsində I şəxsin təki monqol və tunqus-mancur dillərində *-bi* formasında işlənir [99, 69]. Şəkilçilərdə mövcud olan dodaq samitlərinin əvəzlənmələri (*m~b~f~w*) şəxs əvəzliyindəki (I şəxsin təki) əvəzlənmələrlə bağlıdır [26, 58].

**Təkdə**
**II şəxs**

| | | |
|---|---|---|
| **Türk** | şəxs | *-san, -syn, -syŋ, -ŋ, -n* |
| | mənsubiyyət | *-ŋ, -n* |
| **Monqol** | şəxs | *-ši, -š, -č* |
| | mənsubiyyət | *-šiń, -šńi, -čn*$_1$*, -š, -s* |
| **Tunqus - mancur** | şəxs | *-š, -s, -hi* |
| | mənsubiyyət | *-š, -s, -hi, -ndi, -ni, -di, -si* |

Bu formalar **sin* praformasından yaranmışdır. *-sin* forması yalnız türk dillərində qalmışdır. *n* samitinin düşməsi nəticəsində **sin>si* formasında tunqus-mancur dillərində, *tin~čin~či* formasında monqol dillərində qalmışdır [99, 69].

**Təkdə**
**III şəxs**

| | | |
|---|---|---|
| | şəxs | - |
| **Türk** | mənsubiyyət | *-y, -su, -yn* |
| | şəxs | - |
| **Monqol** | mənsubiyyət | *-yń, -īn, -ńə, -ń* |
| **Tunqus - mancur** | şəxs | *-n* (yalnız tunqus dilində) |
| | mənsubiyyət | *-ni, -n, -nin* |

V.Kotviç göstərir ki, türk və monqol dillərində özünü göstərməyən III şəxsin təkindəki şəxs şəkilçisi tunqus-mancur qrupunda (evenk, nanay, neqidal, udeqey və s.) yalnız tunqus dilində mövcuddur [65, 173-174]. III şəxsin formantları da III şəxs əvəzliyindən əmələ gəlmişdir.

**Cəmdə**

**I şəxs**

| | | |
|---|---|---|
| **Türk** | şəxs | *-byz, -myz, -z, -q* |
| | mənsubiyyət | *-myz, -byz* |
| **Monqol** | şəxs | *-bdn*$_1$*, -mdn*$_1$*, -wdn*$_1$*, -bdi, -mdi, -mn*$_1$*, -dn*$_1$*, -bā* |
| | mənsubiyyət | *-mdn, -mnai, -mān, -mn*$_1$ |
| **Tunqus–mancur** | şəxs | *-wun, -w, -u, -un, -pu, -p, -fi* |
| | mənsubiyyət | *-mun, -wun, -mu, -u, -un, -pun, -qun, -γun* |

I şəxs cəminin şəxs və mənsubiyyət şəkilçiləri *biz* əvəzliyindən əmələ gəlmişdir. Bu əvəzlik türk dillərində belə rekonstruksiya edilir: *bi*-I şəxs təkinin əsası +*z*-cəm şəkilçisi. Yaxud *bi+si*-II şəxs təkinin əsası: *biz<bi+si(<sen)* «mən+sən». Monqol

dilində də həmin elementləri eyni qaydada rekonstruksiya etmək olar: eksklüziv əvəzlik *man*, yaxud inklüziv əvəzlik *–bida*, yəni I şəxsin təkinin əsası *-mdn~-mnai~-mn~-man+* ya cəm şəkilçisi *t~d~n*, ya da II şəxsin təkinin (* *tin*) əsası olan *t~d~n*(*bi+da<bi+ti* «mən və sən»). Eyni rekonstruksiya tunqus-mancur dillərinə də aiddir: I şəxsin cəminə aid şəkilçilər bu qrupda *bul~bu~bun* və *muse* əvəzliklərindən törəmişdir. Tunqus dilində *biti~miti* = I şəxsin təkinin əsası olan *-wun, -mun, -mu, -u<m<bu*+ya cəm şəkilçisi *n<t*, ya da II şəxsin təkinin son elementi *(si-n)-biti<bi+ti* «mən və sən».

**Cəmdə**

**II şəxs**

| | | |
|---|---|---|
| | **şəxs** | *-syŋar, -syŋyz, -syz, -ŋyz, -yz, -ŋar* |
| **Türk** | **mənsubiyyət** | *-ŋar, -ŋyz, -nyz* |
| | **şəxs** | *-t'ā, -tā, -t* |
| **Monqol** | **mənsubiyyət** | *-t'ān, -tnai,* $-tn_1$ |
| **Tunqus -** | **şəxs** | *-san, -sun, -šun, -hu, -su, -s, -u* |
| **mancur** | **mənsubiyyət** | *-sun, -hun, -hu, -su, -san* |

II şəxsin cəminə aid olan şəxs və mənsubiyyət şəkilçiləri də analoji yolla rekonstruksiya edilir. Belə ki, türk dillərində-*syŋar~syŋyz*=II şəxs təkinin əsası olan *san~syn*+ya cəm şəkilçisi -*yz>-syŋyz~-synyz~-(sy)ŋyz~-(sy)nyz~-(syn)γiz~-sy(ŋy)z,* ya da *-lar>-syŋlar~-synlar~-syŋ(l)ar~-(sy)ŋ(l)ar.* Monqol dilində *-t'ā, -tā, -t'ān,* $-tn_1$=II şəxsin təkinin əsası olan **tin*+cəm şəkilçisi *-an, -un, -n> t'(in)+ān~-t(in)ā(n)~-tinā(n)~-t(in)(a)n*$_1$*~-t(in+an).* Tunqus-mancur dillərində *-san~-sun(-su, -s)~-šun~hun (-hu, -u)<-s~-š~h (<-sin~-si* şəxs əvəzliyi)+*-(t)an~-n(i)* cəm şəkilçisi.

**Cəmdə**
**III şəxs**

| | | |
|---|---|---|
| **Türk** | Şəxs | - |
| | mənsubiyyət | *-y, -su, -yn* |
| **Monqol** | şəxs | - |
| | mənsubiyyət | *-yń, -iń, -nə, -ń* |
| **Tunqus - mancur** | şəxs | *-tin* (yalnız tunqus dilində) |
| | mənsubiyyət | *-tin, -tan, -ti, -či* |

Göründüyü kimi, bütün Altay dillərində III şəxsin cəminin şəxs və mənsubiyyət şəkilçiləri təkin şəxs və mənsubiyyət şəkilçiləri ilə demək olar ki, üst-üstə düşür. Burada tunqus-mancur dilləri nisbətən istisnalıq təşkil edir.

Altay dillərində sözdəyişdirici şəkilçilərlə yanaşı, ortaqlıq təşkil edən sözdüzəldici şəkilçilər də az deyildir. Bunlara daha çox isim və fel düzəldən şəkilçilər aiddir.

Ad düzəldən şəkilçilər

1) Sənət, peşə adları düzəldən şəkilçilər:

**türk.** *-čy/-či~-džy/-dži~-šy/-ši*; T.türk. *temir* «dəmir»*-temir-dži* «dəmirçi», qaz. *balyq* «balıq»*-balyq-šy* «balıqçı», Alt. *hičik* «kitab»*-hičik-či* «savadlı, bilikli adam», *taryγ* «tarla»*-taryγ-čy* «əkinçi», *ota-čy* «otlarla müalicə edən həkim», tat. *im-či, jum-čy* «həkim (türkəçarəçi)», T. Türk. *deve-ǯi*, qaz. *tüö-či* «dəvə sürən adam, dəvəçi» və s.;

**monq**. *-č~-č(in)*: *tarija-čin, tarijan-či* «əkinçi», *ota-či* «otlarla müalicə edən həkim», *em-či* «həkim», monq. *adagu-či*, kalm. *adūt-ši*, bur. *adū-ši* «atçı, ilxıçı», monq. *qonin-či*, xalx. *χonit-ši* «qoyun otaran, çoban», monq. *temege-čin*, kalm. *temēnt-ši*, bur.

*temēn-ši* «dəvə sürən adam, dəvəçi», *qutal* «ayaqqabı, çəkmə»-*qutal-č* «çəkməçi, pinəçi», *vaar* «bardaq, küpə, güldan»-*vaar-č* «dulusçu» və s.;

**tunq.-manc.** -*č~-či*: *mori-či* «mehtər, atabaxan», *adu-či* «ilxıya baxan, atçı», evenk. *hul-na-č* «qonaq», *kol-na-č* «içən, sərxoş»<evenk. *kol* «içmək» və s.;

**korey.** -*ǯa (-dža)*: *kanan-ǯa* (-*dža*) «yolçu, piyada, yeriyən, gəzən» və s. [99, 209; 132, 53; 26, 83-84].

2) Hər hansı predmetə və ya keyfiyyətə maliklik bildirən şəkilçilər:

**türk**. -*lyγ/lig~-lyq/-lik~luu/-lüü~-ly/-li:* qədim türk. *qan-lyγ il* «xanlı (xana malik olan) xalq», *at-lyγ* «adlı, ada malik olan, adı olan», *alyγ-lyγ* «alınmış, götürülmüş», qaz., tat. *bajlau-ly* «bağlama, düyünləmə, bağlı, bağlanılmış», Alt., tele. *aγa-lū ačy-lu* (<*aγa-lyγ ačy-lyγ*) «böyük və kiçik qardaş», *erlǖ qadytty* (<*er-lig qadyn-lyγ*) «ər-arvad», Alt. *baj-lyq* «var-dövlət, sərvət», *qar-luu* «qarlı, qarla örtülü», q.-qalp. *tas-lyq* «daşlıq, daşlı yer», *čeček-lik* «çiçəklik», *alp-lyq* «alplıq, qəhrəmanlıq» və s.;

**monq.** -*lag/-leg/-lög*: *čečeg-lig* «çiçəklik», *bajan-lag* «var-dövlət, sərvət», *tömör-lög* «dəmirdən və ya başqa metaldan hazırlanmış, metala aid olan» və s.;

**tunq.** -*ruk*: *inme* «iynə»-*inme-ruk* «iynə saxlanılan qutu», *kala* «qazança»-*kala-ruk* «qazança üçün torba, kisə», *suke* «balta»-*suke-ruk* «balta üçün çexol, üz», *turuka* «duz»-*turuka-ruk* «duzqabı» və s.;

**korey.** mürəkkəb -*či-l* şəkilçisinin tərkibindəki -*l* formantı: *no-ǯi-l* «qalaq, yığın», *panį-ǯil* «tikmə, tikiş», *kjo-žį-l* «yapışqan» və s. [99, 47-48, 203, 211; 132, 54; 26, 84].

3) Əşyanın yerləşdiyi yeri bildirən şəkilçilər:

**türk.** *-da-γy/-de-gi~-da-qy/-de-ki~-ta-γy/-te-gi:* T.türk. *ev-de-ki*, q.-qalp. *awul-da-γy* «auldakı, kənddəki» və s;

**monq.** *-de-ki/-te-ki,-da-xi/-de-xi: en-de-ki* «buradakı», *er-te-ki* «ertəki, vaxtından əvvəl, vaxtsız, faraş», *ger-te-ki* «evdəki», *tengri-de-ki* «göydəki», *dorno-do-xi* «şərqdəki», *ereg-de-xi* «sahildəki» və s.;

**tunq.** *-du-ki~-du-k~-dukki*; *er-du-ki* «ertəki, əvvəl» və s. [99: 43, 216; 132, 54; 26, 84-85].

4) Predmetin və ya keyfiyyətin yoxluğunu bildirən şəkilçilər:

**türk.** *-syz/-siz: at-syz* «atsız», *ata-syz, en-siz, jer-siz*, çuv. *an-zəˈr* «nazik», *kán - zəˈr* «çətin, ağır» və s.;

**monq.** *-ser/-sar*: *kejisümü-ser* «küləkdən sovrulmayan», *uqam-sar* «gözlənilməz», *ölüsümü-ser* «acından ölməyən», *sanam-sar* «qəsdən edilməyən, təsadüfən» [99, 215; 26, 85].

<u>Feldən ad düzəldənlər</u>

1) **türk.** *-yš/-iš, -š~-ys/-is,-s*: *kel-iš*, *vur-uš*, *ged-iš*, *al-yš*, q.-qalp. *at-ys* «atış, güllə atmaq» və s.;

**monq.** *-l, -ts***:** *bodox* «düşünmək»-*bodo-l* «düşüncə», *zanšix* «öyrəşmək, adət etmək»-*zanši-l* «adət», *dajlax* «döyüşmək»-*dajla-l* «hücum», *temiex* «vuruşmaq»-*temie-l* «vuruş», *bari-ts* «göndəriş, barat», *tavi-ts* «dayaq, dəstək, dirək», *turxe-ts* «yaxma, yaxım, yaxı» və s. [26, 85; 132, 54-55].

2) **türk.** *-ym/-im, -m***:** *al-ym* «alım, borc», *öl-üm* «ölüm», uyğ. *ked-im*, qaz. *kij-im* «geyim, paltar», *jar-ym* «yarım, sevgilim», *jut-um* «udum, qurtum, içim», *tis-le-m* «dişləm, dişləmə, qapma», *ye-m* «yem, yemək» və s.;

**monq.** *-im, -m*: *keǯ-im* «çul, geyim», *ǯar-im* «bir neçə, bir qədər, bir müddət», *ǯe-m* «cəmdək, leş, yem, yeyilmiş, porsiya», *xer*

*či-m* «tikə, parça, dilim», *toxo-m* «tərlik, yəhəraltı», *alxa-m* «addım» və s.;

**korey.** *-m, -im***:** *sara-m* «həyat, diri (adam)», *čug-įm* «ölüm», *mud-įm* «qəbir, məzar», *ha-m* «iş» [99, 106; 132, 56; 26, 85].

3) **türk.** *-yq/-ik, -q/-k*: Alt. *biči-k* «kitab», uyğ. *jama-q* «yamaq, pinə», T.türk. *qap-u (q)* «qapı»və s.;

**monq.** *-ik, -k, -g*: *biči-k* «məktub, yazı», *zura-g* «şəkil, rəsm» və s. [26, 85-86; 132, 56].

Adlardan ad düzəldənlər

**türk.** *-la/-le~-da/-de,-ta/-te*: *baš-la~baş-la* «başla» (*baš~baş* «baş»), *tiš-le~tiş-le* «dişlə» (*tiš~tiş* «diş»), tat. *jög-la~jugu-la*, T. türk., noq. *ujgu-la* «yuxula, yat» (*jög~jugu~ujgu* « yuxu»); *ün-tä* «səslə, çağır» (*ün* «səs»); *al-da* «aldatmaq» (*al* «yalan»).

**monq.** *-l~-la/-le, -da/-de~-ra/-re*: *sugu-l* «çıxmaq, dartılıb çıxarılmaq», *öte-l* «qocalmaq» (*ötegü* «qoca»), *dagu-la* «oxumaq» (monq. *dagun*, kalm. *dūn* «səs, mahnı»), *dagu-da* «səslə, çağır», *arga-ga* «aldatmaq» (*arga* «hiyləgərlik»), *alaga-da* «döymək (əllə)» (*alaga* «əl»), *el-de* «rəhbərlik etmək; əllə dərini yumşaltmaq» (<türk. *el*, çuv. *al* «əl»), *jeke-re* «böyümək, böyük olmaq» (<*jeke* «böyük»), *xöx-ro* «göyərmək» (*xöx* «göy»)

**tunq.** *-l, -la/-le, -da/-de*: *hawa-l* «işləmək, hərəkətdə olmaq» (*hawa* «iş, hərəkət»), *nama-l* «istilənmək» (*nama* «isti»), *mu-le* «su ilə getmək» (*mu* «su»), *daw-la* «oxumaq» (*daw* «səs, ton»), *busẹ-lẹ* «qurşanmaq, sarınmaq» (*vuse* «qurşaq»), *sukẹ-dẹ*, nan. *surẹ-dẹ* «balta ilə doğramaq» (*suke<sure* «balta») [99, 173; 26, 86; 132, 97].

**Felin funksional formaları**

Dilçilik ədəbiyyatlarında felin funksional formalarına əsasən məsdər, feli sifət və feli bağlama daxil edilir. Altay dillərinin, demək

olar ki, hamısında bu formalar eynilik təşkil edən ümumi qrammatik vasitələrlə yaranır.

Məsdər

Məlumdur ki, məsdərlər felin substantivləşmiş (özündə ismin əlamətlərini də daşıyan) formasıdır və ad (hərəkətin adını) bildirir.

N.A.Baskakov türk dillərində məsdərin aşağıdakı formalarının mövcud olduğunu qeyd etmişdir:

1. *-γy/ -qy, -γu/ -qu, -yγ/ -yq, -uγ/ -uq* şəkilçiləri vasitəsi ilə düzələn və qədim türk, eyni zamanda yeni uyğur və özbək, noqay, qazax, qaraqalpaq dillərində daha çox müşahidə olunan forma;

2. *-maq, -ma, -m* şəkilçiləri ilə yaranan və əsasən oğuz qrupu türk dilləri üçün xarakterik olan forma;

3. *-yš,-š~-ys,-s* şəkilçiləri vasitəsilə düzələn və karluq qrupu türk dillərində geniş yayılan forma;

4. *-yt, -t* şəkilçiləri vasitəsilə düzələn və qeyri-məhsuldar şəkildə müasir Altay, qırğız dillərində rast gəlinən forma [26, 66-67].

Türk dilləri üçün xarakterik olan bu formalar digər Altay dillərində də mövcuddur:

**1. Türk**. *-γ, -γy/-qy, -γu/-qu>-uw>-uu>-u>-y;*

**monq.** *-γa/-qa, -γu/-xu;*

**tunq.-manc.** *-gi, -go, -gu* [26, 66; 28, 20].

Türk dillərindəki *-γ/-γu/-γy*, monqol dillərindəki *-γa/-ga(-uga/-ija)/-gan(-ugan/-ijan)* və şifahi nitqdəki *-ā, -ān* şəkilçilərindən danışarkən Q.Ramstedt qeyd edir ki, bunlar vasitəsilə əmələgəlmə infinitiv (məsdər) xarakteri daşıyır, monqol dillərində isə ilk növbədə hərəkətin nəticəsini ifadə edir və onlar bir-birilərinə uyğun gəlirlər. Məsələn, *jaz-yγ-či* «katib, yazan» (türk dillərindəki şəkilçilərin daha qədim fonetik forması *-yγ/-γ*, qərbi türk qrupunda *-ū*, çuv. *-u, -w*, yaxud «sıfır səslə», yak. isə *-y*[1], *-ū, -i*[1], *-ǖ* fonemləri vasitəsilə ifadə

edilir, cənubi türk qrupunda isə söz sonunda -*γ* itir. Eyni zamanda qərbi türk qrupunda -*γ* sonda kar olarsa, ya -*k, -q*, ya da «sıfır səsə» təsadüf edilir), *sat-yγ-či* «alverçi, tacir», *käl-ig-či* «gəlmə, özgə, yad, qərib», tat. *yaz-ūčy, sat-ūčy, käl-üčy*; *bir-ǖči* «təqdim edən, verən, gətirən», *al-ūčy*, yak. *ylysyt* «alan, alıcı» [99, 124-126].

Türk dillərindəki -*gči* (hərəkətin adını bildirən şəkilçi) sonluğu monqol dilindəki eyni qrammatik mənanı ifadə edən -*gči*, yaxud -*gači* şəkilçisi ilə uyğun gəlir. Məsələn, *bič-i-gči, bič-i-geči* «yazan», *tusal-a-gči, tusal-a-gači* «köməkçi», *jav-u-gči, jab-u-gači* «yola düşən, gedən», kalm. *bitšätši, tuslāši, jawātši.*

Türk dillərindəki -*γu-č* şəkilçisi tunqus dilindəki -*ki-t* (cəm halda -*kičil*) şəkilçisinə uyğun gəlir. Məsələn, *húrgú-kit* «dəyirman» (*húrgú* «üyütmək»; müq.et: monq. *üre, ürü,* türk. *üz*), *tat-kit* «məktəb» (*tat* «oxumaq, öyrənmək»; müq. et: tat. *tatymal* «öyrədilmiş, alışdırılmış»), *bi-kit* «ev, məskən, yurd» (*bi* «olmaq»), *ak-kit* «təyin olunma yeri, təyin olunmuş yer» (*ag/ağ* «çatmaq, yetişmək»; müq. et: monq. *ajil,* türk. *aγyl, aul* «yaşayış yeri, oba, köçəri düşərgəsi»), *ajit-kit* «xəstəxana» (*ajit* «müalicə etmək») [99, 91].

Qədim türk dillərində (Orxon abidələrinin dilində və uyğur mətnlərində) olduğu kimi, müasir türk dillərində də mövcud olan feldən məsdər düzəldən -*γu, -gü* şəkilçilərinə (qır., qaz., Sibir türklərinin dialektlərində -*ū~-ǖ* və yak. -*w*) monqol dilində rast gəlinir. Bu şəkilçi feldən hal-vəziyyət keyfiyyətini ifadə edən sifət düzəldir: *daru-γu* «sözə baxan, üzüyola» (*daru* «əzmək, təzyiq etmək, sıxmaq, sıxışdırmaq»), *soγto-γu* «kefli, məst» (*soγto* «sərxoş olmaq») [65, 297-298].

Türk. -*γu (-gü)*, monq. -*qu, -qui, -qun* (müasir dialektlərdə -*χu~-kü, -kə*), tunq. -*gi~-ki* (arxaik -*qui, -kui*) şəkilçiləri müxtəlif

hallarla müəyyən məqsəd, məram mənasında işlənir. Məsələn, türk. *tut-γy* «tutmaq, yaxalamaq»-*tut-γu-γa* «tutmaq üçün, tutmaqdan ötrü», xalx. *aw-χu-lā*, bur. *ab-χu-jā*, manc. *ana-gi-ni* «toxunmaq üçün, toxunmaqdan ötrü», nan. *ene-gi-i tambi* «getmək istəyirəm» [99, 89-91; 123, 253-254].

Türk və monqol dillərində bir-biri ilə sıx bağlı olan və hərəkətin nəticəsini bildirən *-γu/-γy, -qu/-qy, -uγ/-yγ, -uq/-yq, -γ/-g, -q~-x/-k* şəkilçilərinə də rast gəlinir: türk. *qap* «bağlamaq, qıfıllamaq» *qap-uγ~qap-u~qapy* «qapı», *jaz* «yazmaq» uyğ. *jaz-yγ* «yazma, yazılma, yazı», T.türk. *jaz-u, jaz-y*, tat. *jaz-u*, balk. *zaz-ū*, çüv. *śį̄r-ū* «yazı, imza, məktub», türk., monq. *qori* «qadağan etmək, qarşısını almaq» uyğ. *qor-yγ, qor-uγ* «qoruğ», monq. *qori-ja* «ayrılmış sahə», kalm. *χorā* «şəhərin bir hissəsi, kvartal», türk., monq. *tari* «əkmək, səpmək, əkinçiliklə məşğul olmaq», türk. *tar-yγ* «taxıl, dənli bitki», T.türk. *dar-y*, çuv. *tįrə* «dənli bitki, fəsilə», monq. *tari-ja* «taxıl, dənli bitki», kalm. *tarā, tarān*, türk. *tar-yγ-čy* «əkinçi, rəncbər», monq. *tari-jā-čin*, kalm. *tarā-či, tarā-tšin* «kəndli» [99, 125].

**2. Türk**.*-maq, -ma, -m;*

**monq.** *-maγ, -ma, -m;*

**tunq.**-*manc. -maq, -ma* [26, 68; 28, 22].

Feldən məsdər düzəldən *-maq* şəkilçisi daha çox türk dillərində (xüsusilə qərbi oğuz qrupunda) məhsuldardır. Məs., T.türk. *al-maq, gör-mek*, Alt. *kör-mök* «görmək», q.-qalp. *oj-maq*, uyğ. *aj-maq*, qır. *qoš-moq* «dəvənin hibridi, qatışıq, mələz», monq. *xāγur-maq*, xalx. *xūr-maq* «aldatmaq», *ide-meg* «çox yemək, qarınqululuq etmək», *cida-mag jada-mag* «mümkünlük və qeyri-mümkünlük», kalm. *zori-məg* «qoçaq olmaq, cəsarətli olmaq», tunq. *mel-mak om* (*o+m=om* «olmaq»~türk. *bol~ol*) «mən qəfil oyandım», *gün-mek om* «mən danışdım», *iče-mek* «onda maraq yarandı» və s. Bu şəkilçi

Koreya dilində də özünü göstərir: *til-mek hada* «qaldırmaq» və s. [99: 102, 106; 65, 225].

*-ma* şəkilçisi türk dillərində substantiv və adyektiv mənalarda işlənir: *bas-ma* «çap, çap etmə», *jaz-ma* «yazı, əl yazısı», *qajna-ma* «qaynama», *bükle-me* «büzmə, büküş, qırış», *ijil-me* «əyilgən, elastik» və s.

Bu şəkilçi monqol dillərində də eyni mənada işlənir: ord. *tenŋgeride t'ul-ma* «göyədəki, hündür», xalx. *χudχu-ma* «sıx, qalın» və s.

Tunqus-mancur dillərində də *-ma* şəkilçisi digər Altay dillərində olduğu kimi, substantiv və adyektiv mənalarda, eyni zamanda feldən yaranmış sifət yerində işlənir: *girku-ma* «piyada», *tuksa-ma-t* «çaparaq», *irẹ-mẹ-ǯẹ* «qonaq» və s. *-ym, -m* şəkilçiləri bütün Altay dillərində məhsuldardır və hərəkətin nəticəsini bildirir. Məsələn, türk. *al-ym* «alma, alınma, borc», *öl-üm*, uyğ. *ked-im* «paltar, geyim», *bil-im* «bilik», *je-m*; monq. *udu-m* «qohum», *hari-m* «pəncə, əl», *quri-m* «toy», *nagad-um* «oyun», *xer-čim* «tikə, loğma», *toxo-m* «tərlik», *alxa-m* «addım» və s. [99, 100-107; 26, 68-69; 28, 22-24; 132, 56; 65, 225].

**3. Türk.** *-yš, -š*; Azərb. *vur-uš, döj-üš*, yeni uyğ. *kel-iš* «gəliş, gəlmə», *el-iš* «alış, alma», *tany-š, öl-üš* «ölüm, ölüş»;

**monq**. *-yl, -l;*

V.Kotviçin qeyd etdiyinə görə, türk dillərindəki *š* səsinin monqol dillərində *l* səsinə keçməsi (lambdaizm hadisəsi) təkcə söz kökündə deyil, şəkilçilərdə də geniş yayılmışdır. Bu baxımdan türk dillərində mövcud olan *-yš, -š* şəkilçiləri monqol dillərində *-yl, -l* formasında ifadə olunur. Məsələn, *tani-l* «tanış», *ükü-l* «ölüm», *törü-l* «doğma, doğulma, doğuluş», *bodo-l* «fikir» (*bodox* «fikirləşmək, götür-qoy etmək»), *zanši-l* «adət, vərdiş» (*zanšix* «adət etmək, vərdiş

etmək»), *zoxio-l* «əsər» (*zoxlox* «yaratmaq»), *dajla-l* «hücum» (*dajlax* «vuruşmaq»), *temie-l* «döyüş» (*temiex* «döyüşmək»), *zana-l* «təhlükə» (*zanax* «hədələmək, təhlükə yaratmaq») [99, 132-133; 65, 310; 26, 69; 28, 24; 132, 54].

**4. Türk.** *-yt, -t;*

Bu şəkilçi qədim türk dilində daha geniş yayılsa da, yalnız müasir Altay və qırğız dillərində saxlanmışdır. Məsələn, Alt. *čyγ-yt* «çıxış», *baz-yt* «yeriş», qır. *toj-ut* «yem», *soj-ut* «kəsmək üçün mal-qara» və s.

**monq.** *-ys, -s, - s(un)*;

Türk dillərindəki *-yt, -t* şəkilçiləri monqol dillərindəki *-ys, -s, -s(un)* şəkilçilərinə uyğun gəlir: *alǯijas-s* «yorğunluq», *alda-s* «səhv, xəta», *xali-sun*, xalx. *xali-s* «qabıq», *nilbu-sun* «göz yaşı», *köge-sün* «qiymət», *cabči-da-sun* «talaşa, yonqar» (cabči «doğramaq»).

V.Kotviçin fikrincə, mancur dilindəki *-sun* şəkilçisi monqol dilindən alınmışdır: *χuwala-sun* «razılıq; harmoniya» [26, 70-71; 28, 25-26; 65, 310-311].

<u>Feli sifət</u>

Məlumdur ki, feli sifət felin atributiv funksiya yerinə yetirən formasıdır və özündə həm felin, həm də sifətin əlamətlərini daşıyır. N.A.Baskakov türk dilləri üçün xarakterik olan aşağıdakı feli sifət formalarını göstərmişdir:

1. *-γaj/-qaj* şəkilçiləri ilə düzələn, predikativ funksiya yerinə yetirib gələcək zamana aid olan feli sifətlər;

2. *-ar, -yr~-ur, -r, -jur* şəkilçiləri ilə düzələn feli sifətlər də predikativ funksiya yerinə yetirir və mənasına görə gələcək zamana aid olur.

3. -*myš* şəkilçisi ilə düzələn feli sifətlər həm predikativ, həm də atributiv funksiyalar yerinə yetirir, keçmiş zamana aid olur və daha çox oğuz qrupu türk dilləri üçün məhsuldardır.

4. -*γan* şəkilçisi ilə düzələn feli sifətlər mənasına görə keçmiş zamana aiddir, predikativ və atributiv funksiyaya malikdir, daha çox qıpçaq və karluq qrupları üçün xarakterikdir.

5. Keçmiş zamana aid olan -*dyq* şəkilçisi vasitəsilə düzələn feli sifətlər oğuz qrupu türk dillərində daha çox məhsuldardır.

6. -*sun* şəkilçisi vasitəsilə düzələn feli sifətlər yalnız predikativ funksiyaya malikdir və -*γusy, -asy, -sa* şəkilçiləri ilə əmələ gələn feli sifətlərlə əlaqəlidir.

Bu altı forma Altay dillərinin hamısı üçün ümumilik təşkil edir [26, 71-72; 28, 27].

**1. Türk.** -*γaj, -qaj*.

Bu şəkilçilər vasitəsilə düzələn feli sifətlər türk dillərində gələcək zamana aid olan arzu formasının yerində işlənir. Məsələn, koyb. *bol(q)aj-män* «istəyərdim ki, olum», Alt. *bol-goj*, tat. *bul-gaj* «bəli, olacaq» və s;

**monq.** -*γai, -xai.*

-*γai, -xai* şəkilçiləri vasitəsilə monqol dillərində də gələcək zamana aid olan arzu formasının funksiyasını yerinə yetirən feli sifət, həm də feldən sifət düzəlir. Məsələn, *ög-tü* (ikinci dərəcəli əsas)-*gai* «qoy o versin, verəydi», *bau-tu-gai* «qoy düşsün», *xazai* «əyilmiş»-*xaza-γai* «əyri», *tasura* «qopmaq, qırılmaq, kəsilmək»-*tasur-xai* «qoparılmış, kəsilmiş» və s.;

**tunq.-manc.** -*ga, -gā*: məs., *il-ga-t* «gəlsənə qalxaq», *guni-gē-t* «gəlsənə deyək» və s.

Altay dillərindəki -*γai/-qaj* şəkilçisinin fonetik və semantik inkişafının ümumi təkamülünü indiki-gələcək zaman feli bağlama

şəkilçisinin inkişafı hesab etmək olar: türk. *-a/-e, -j~-y/-i~-u/-ü~ju/-jü~-γa/-ge*. Məsələn, qədim türk. *jaša-ju*, müasir türk. *jaša-j* «yaşayaraq», *bašla-ju~bašla-j* «başlayaraq», *kel-e~gel-e* «gələrək», *al-u* «alaraq», *bir-ü* «verərək», *bar-u* «gedərək», *te-j-ü* «deyərək»; monq. *-a/-e~-ai̯/-ei̯*, yazılı dildə *-ga/-ge*. Məsələn, *jabú-a-ǯam* «gedilən yol», *bagu* «enmək»-*bagu-ga* (kalm. *būgā*) «enərək», *baji-ga*, bur. *bai-gā*, kalm. *bägä* «qalaraq», *kögüge* «qovularaq»; türk. *bas* «basmaq»-*bas-a* «basaraq»>zərf «yenidən, sonra», monq. *daru* «basmaq», *daru-i* «basaraq»> «sonra», manc. *ǯaf-a-na*, tunq. *d’aw-a-na* «götürmək üçün getmək», korey. *čab-a-na* (<*čap* «almaq, götürmək»+*a*-feli bağlama şəkilçisi+*na* «çıxmaq»), *ban-a-l-dom* «mən tapmağa başladım» (<*bak* «tapmaq»+*a*-feli bağlama şəkilçisi+*il* «başlamaq») və s. [26, 72; 28, 28-29; 99: 87,108-108].

**2. Türk**. - *ar~-yr~-ur~-r~-jir*.

*-ar, -r, -jir* şəkilçiləri vasitəsilə düzələn feli sifətlər felin xəbər formasının yerində işlənir. Məsələn, qədim türk. *qazγan-ur* «qazanır» (*qazγan* «qazanmaq, qazan»), *käl-ür, käl-ir* (*käl~kel* «gəlmək, gəl»), *jaša-jur* «yaşayır» (*jaša* «yaşamaq, yaşa»).

*-ar,-yr,-ur,-r* şəkilçiləri adyektiv və substantiv mənalar yaradan şəkilçilər vəzifəsində də işlənir: *ač* «aç»~*ač-ar, ač-yr, aç-ur* «açar», *qat* «qatmaq, qarışdırmaq»~*qat-yr* «qatır», *uč* «uçmaq»~*uč-ar~uš-ar* «köçəri (quş)». Bu formalar yönlük halın şəkilçisi ilə birlikdə məsdər yaradır. Məsələn, *al-ur-γa, al-ar-γa* «almaq üçün», *käl-ir-gä, käl-är-gä* «gəlmək üçün», *tut-ur-γa, tut-ar-γa* «tutmaq üçün» və s.;

**monq.** *-ar~ur,-r*.

Monqol dillərində də bu şəkilçilər adyektiv və substantiv mənalar yaradır: *bol-ur-a* «almaq üçün», *ir-er-e* «getmək üçün», *ab-ur-a* «götürmək üçün», *kele-r-e* «demək üçün» və s.;

**tunq.-manc.** *-r, -ra,-ri.*

Tunqus-mancur dillərində *-r, -ra* şəkilçiləri vasitəsilə gələcək zamana aid olan feli sifət əmələ gəlir: *χoninmo wa-r* «kəsilmək üçün olan qoyun», *em-ri* (<*eme-ri<*eme-ren,* cəmdə *eme-ril<*eme-rel*) «gələn», *qö-ni* (<*qön-ri<*qön-ren) «danışan, söyləyən». [26, 73; 28, 29-30; 99, 86; 123, 216].

**3. Türk**. *-myš* .

Keçmiş zaman feli sifət şəkilçisi olan *-myš* türk dillərindən daha çox oğuz qrupunda məhsuldardır: T. türk. *jaz-myš* «yazmış, yazılmış», *gel-miš* «gəlmiş», eyni zamanda qırğız dilində *ǯe-miš* «yeyəcək, yem, azuqə», *tur-muš* «həyat, dirilik» və s;

**monq.** *-mal***.**

Monqol dillərindəki *-mal* şəkilçisi türk dillərindəki *-myš* şəkilçisinə uyğun gəlir. Məsələn, *xerč-mel* «doğranmış, qırılmış»-*xerčix* «doğramaq, qırmaq», *türx-mel* «yaxılmış, sürtülmüş, bulanmış»-*türxex* «yaxılmaq, bulanmaq», *bič-mel* «yazılmış»-*bičix* «yazmaq», *bud-mal* «boyanmış, rənglənmiş»-*budax* «boyamaq, rəngləmək», *xad-mal* «mıxlanmış, çalınmış, vurulmuş»-*xadax* «mıxlamaq», *sonqo-mol* «seçilmiş»-*sonqox* «seçmək», *qör-möl* «hörülmüş»-*qöröx* «hörmək» və s.

Tunqus-mancur dillərində bu şəkilçi məhsuldar deyildir [26, 73-74; 28, 30-31; 132, 78].

**4. Türk.** *-γan, -qan, -jan, -an.*

Bu şəkilçilər (xüsulə *-γan*) türk dillərinin qıpçaq, karluq qruplarında daha geniş yayılmışdır və əsasən predikativ, atributiv funksiyalar yerinə yetirir. Oğuz qrupunda da həmin şəkilçilər atributiv forma yaradır. Məsələn, uyğ. *qač-γan*, Azərb., T. türk. *qač-an*, tat. *qač-qan*, qaz. *qaš-qan,* xak. *qas-qan* «qaçan», uyğ. *ojna-γan*, qaz. ojna-gan, xak. *oj-nān* «oynağan», q.-qalp. *al-γan* «alan», *kes-ken*

«kəsən», *ač-qan* «açan», Azərb. *oxu-jan*, T. türk. *oqu-jan* «oxuyan» və s.

**monq.** *-γan.*

Monqol dillərində bu şəkilçiyə daha çox xüsusiləşmiş formalarda rast gəlinir: jabu-gan «piyada gedən», *tur-γan~tura-χan~turu-χan~turaŋ-χai~tur-qan~turu-qsan* «arıq, sısqa» (*turu, tura* «arıqlamaq»), *χubil-γan* «ifadə etmə; daxil etmə, dəyişmə» (*χubil* «dəyişmək»), *öči-ken//öči-gen* «bu yaxınlarda; bir az bundan əvvəl, dünən», *čakil-γan* «şimşək» (*čakil* «parıldamaq»), *čiγūl-γan* «yığıncaq» (*čiγūl* «yığışmaq»), *ide-gen* «yemək, yeyəcək, yeyinti» (*ide* «yemək»), *uda-γān* «uzun» (*uda* «uzanmaq») və s.;

**tunq.-manc.** *-ha, -han, -χan, -kan, -ken, -xen, -qa, -ka, -he, -hen*: nan. *hola-han* «oxuyan», *bil-he* «keçmiş», *ali-ha* «qəbul edən; başlayan», *ǯuan-ka* «açan, açılan» və s. [26, 74; 28, 31-32; 99, 134-136; 65, 288-290].

**5. Türk.** *-dyq/-duq>dy, -čux/-čuq* (yak. *-tax/-täx*);

**monq.** *-daγ, -ǯu, -ču, -ǯuxuj, -čuxuj;*

**tunq.-manc.** *-dig.*

Türk dillərindəki *-dyg/-dug>dy* şəkilçiləri vasitəsilə əmələ gələn feli sifətlər bir qayda olaraq keçmiş zamana aid olur və monqol dillərindəki *-daγ, -ǯu, -ču, -ǯuxuj, -čuxuj*, tunq.-manc. dillərindəki *-dig*, türk dillərindəki *-čux/-čuq* şəkilçiləri *-dyg/-dy* şəkilçiləri ilə eyni kökdən yaranmışdır. Məsələn, xak. *čyyl-ǯyx* «yığışmış», *čax-čyx* «qalxmış», monq. *xad-dag* «əyilmiş» (*xadax* «əymək»), *udird-dag* «rəhbərlik edən» (*udirdax* «rəhbərlik etmək»), *ol-ǯe* «tapan» (*ol* «tapmaq»), *sana-ǯe* «düşünən» (*sana* «düşünmək»), *gar-čē* «çıxan» (*gar* «çıxmaq») və s. [26, 75; 28, 32-33; 132: 108-109, 139-140].

**6. Türk**. *-sun, -syn;*

**monq.** *-su, -sun;*

**tunq.-manc.** *-su*.

Hər üç dil qrupundakı şəkilçilər istək, arzu mənasını yaradan *-su~-sa* şəkilçisindən yaranmışdır. *-sun,-syn,-su* şəkilçiləri vasitəsilə bütün Altay dillərində felin əmr və arzu formaları əmələ gəlir. Məsələn, türk. *käl-sün, kel-sin* «gəlsin, qoy o gəlsin», *al-syn* «qoy alsın», monq. *bol-su* «olsaydı», *ide-sü~ide-sun* «yaxşı olardı ki, yesin», *ire-sü~ira-sun* «yaxşı olardı ki, gəlsin», tunq.-manc. *bi-su* «olsaydı», nan. *ẹnẹu-su* «gedin» (*ẹnẹu* «get») və s.

Bu formalar aşağıdakı mürəkkəb şəkilçilərlə sıx əlaqəlidir:

**türk**. *-sa<-sa-r<-yγ-sa-r; -γu-su>-a-su;* məsələn, türk. *al-sa* (*<al-yγ-sa-r*) «əgər o alsa», tat. *kil-ä-si bar* «o gəlməlidir, o gələ bilər»;

**monq**. *-aasai (-oosai, eesei, -öösei)*: *unš-aasai* «oxusaydı, yaxşı olardı» (*unš* «oxu»), *tusl-aasai* «kömək etsəydi, yaxşı olardı» (*tusl* «kömək et»), *xür-eesei* «çatsaydı, yaxşı olardı» (*xür* «çat»), *med-eesei* «bilsəydi, yaxşı olardı» (*med* «bil»), *ög-öösei* «versəydi, yaxşı olardı» (*ög* «ver»);

*-γu-su>-a-sy*: *ide-si ügei* «yeyilməyən», *ide-si-tü, ide-si-tei* «yeyilən», *jabu-si ügei* «keçilməyən», *jabu-si-tu* «keçilən» və s. [26, 75-76; 28, 33-34; 99: 83, 130; 132, 103].

Bütün bunlardan başqa qırğız türkoloqu S.Kudayberqenov «Altay dillərində fel tipləri» adlı məqaləsində Altay dilləri üçün ümumilik təşkil edən bir neçə feli sifət və feli bağlama şəkilçilərinin eyni maddi əsasdan yarandığını inandırıcı şəkildə sübut etmişdir [66, 395-400].

### 3. 4. Leksik-semantik səviyyə

Altay dillərinin fonetik və morfoloji səviyyələrində mövcud olan hədsiz uyğunluqlar leksik səviyyədə də özünü aydın şəkildə göstərir. Qeyd edək ki, Altay dilləri arasında müvafiq leksik paralellik daha çox türk və monqol dillərinin payına düşür. Buna səbəb isə çox ehtimal ki, yapon, Koreya və tunqus-mancur dillərinin Altay dil ailəsində kök dildən daha erkən ayrılmasıdır. Lakin bununla belə, bu dillərin (xüsusilə tunqus-mancur dil qrupunun) də qismən türk, daha çox monqol dilləri ilə ümumilik təşkil edən (yəqin ki, monqol dillərinin digər Altay dilləri arasında aralıq mövqe tutması ilə bağlıdır) leksik uyğunluqlar mövcuddur.

Altay dilləri üçün ümumilik təşkil edən leksik vahidləri iki cür qruplaşdırmaq olar: 1) dillərin əksəriyyəti üçün milli olan xalis sözlər; 2) dillərin qarşılıqlı əlaqəsi nəticəsində bir dildən başqa dilə keçmiş alınma sözlər.

Türk və monqol dillərini müqayəisə edən qazax alimi S.D.Nominxanov üç əsas nitq hissəsini tədqiqata cəlb edərək 1500 söz kökünün (938 isim, 145 sifət və 477 fel) uyğun olduğunu müəyyənləşdirmişdir [86, 10]. Tatar dilçisi A. X.Nuriyeva isə monqol və tatar dillərində 1300-ə yaxın sözün leksik uyğunluğa malik olduğunu göstərmişdir [88, 379]. Leksik vahidlərin genetik qohumluğunu izləmək üçün onlara qruplar üzrə diqqət yetirək:

**ADLAR**

***1.Qohumluq bildirən terminlər:***

1) **monq**. *abu,* kalm. *aaba,* xalx. *ab, aba,* bur. *aba* «ata, dədə»; **türk**.: tele., şor., saq. *aba,* T. türk. *abe* «ulu baba», qır. *aba* «əmi», türkm. *aba* «ata», xak. *abaa* «böyük qardaş», qar.-balk. *aba,*

noq. *abaj* «anaya, nənəyə müraciət»; **manc.** *ama* «ata» və s. [87, 64; 91, 30; 126, 49; 137, 130].

2) **monq**., bur. *exe,* xalx. *ex*, kalm. *eke* «ana»; **manc**. *eme*, evenk. *en'e*; **korey**. *omi* «ana»; **türk**.: Alt., q.-qalp., qır. *ene*, çuv. *anne*, *ama* , türkm. *ene* «ana», tuv. *ene* «xala», qaz. *ene* «qayınana», qar.-balk. *amma* «nənə,qarı» və s. [87, 64; 91, 22; 126, 50; 137, 130-134].

3) **monq**. *ečige*, xalx. *eceq*, bur. *ecege* «ata», kalm. *ecege* «ata, valideyn»; **manc**.: evenk. *ata* «baba»; **türk.**:qır. *ateke* «baba», *ata* «ata», tat. *etkey* «ata, atacıq (əzizləmə mənasında)», *eti* «ata», çuv. *atee*, *ette*, özb. *ota*, tel. *oda*, Azərb., baş., qaz., q.-qalp., türkm., uyğ., qar.-balk. *ata* «ata» və s. [87, 65; 91, 25; 126, 50; 137, 130].

4) **monq.**, xalx., bur., kalm. *axa* «böyük qardaş, böyük»; **türk.:** qır., qaz., yak., tat., türm., qaq. *aga*, Azərb., baş., q.-qalp., T. türk., xak. *ağa* «böyük qardaş, böyük, ağa», qar.-balk. *akka* «baba, qoca» və s. [87, 64; 91, 33; 126, 49].

5) **monq.** *ači*, xalx. *ač*, bur. *aša* «nəvə; bacıoğlu, qardaşoğlu», kalm *ači* «nəvə; kişi tərəfdən ikinci dərəcəli qan qohumu»; **türk.:** tuv. *ača, ačaj* «ata», özb. *ača* «nənə», uyğ. *ača* «böyük bacı», xak. *ača* «böyük qardaş, əmi», Alt. *ačy* «atanın kiçik qardaşı; qardaşın oğlanları, qızları və nəvələri» və s. [87, 65; 91, 28].

6) **monq.** *edži, edžej* «ana, nənə», xalx. *eež*, bur. *ežy*, kalm. *eedži* «ana»; **türk.:** qaz. *äže* «nənə; ana», qır. *eže* «böyük bacı; bibi», türkm. *eže* «ana, bibi, böyük bacı», yak. *ije*, xak. *iče* «ana», Azərb. dialektlərində *čiči/čiži/čiji* «ana (əzizləmə mənasında)» və s. [87, 65; 91, 28].

7) **monq.,** bur., kalm. *ere*, xalx. *er* «ər, kişi, həyat yoldaşı»; **türk.**: Alt., qaz., q.-qalp., qır., tuv., T. türk., özb., yak., qar.-balk.,

noq. *er*, Azərb., türkm., uyğ., şor. *är*, baş., tat., xak. *ir*, çuv. *ar* «ər, kişi» və s. [87, 66-67; 91, 57; 126, 52].

8) **monq.** *bölö, böle*, bur. *büle* «əmioğlu, dayıqızı», xalx. *bül* «əmioğlu, dayıqızı, xala uşaqları», kalm. *bole* «dayıoğlu»; **türk.**: Alt. *bölö* «bacının uşaqları, əmioğlu, əmiqızı», baş. *bülä* «nəticə (nəvənin oğlu)», *büläsär* «nəticə (nəvənin qızı)», qaz. *böle* «dayıqızı, dayıoğlu», qır. *bölö* «xala uşaqları, əmioğlu, dayıqızı», xak. *pöle* «xala uşaqları» və s. [87, 66; 91, 53].

9) **monq.:** kalm. *urug*, «qohum, quda», xalx., bur. *urag* «qohum-əqraba, quda»; **türk.:** baş. *yryu* «nəsil», qaz. *urük* «ailə», *ru* «nəsil», q.-qalp. *uru* «cins», qır. *uruk* «ailə, soy, əsil-nəsəb, nəsil, tayfa», tat. *yri* «nəsil, qohum-əqraba, tayfa», türkm. *urug* «nəsil», özb. *urug* «ailə, nəsil, tayfa», qar.-balk. *urluk*, noq. *urlyk* «ailə, nəsil» və s. [87, 69; 91, 42; 126, 51].

10) **monq.** *türxüm*, kalm. *törkön*, xalx. *törxöm*, bur. *türxem* «arvadın qohumları, ərli qadının valideynləri»; **türk.:** qaz. *törkin* «ərli qadının qohum-əqrabası», qır. *törkün* «arvad qohumları», Alt., tuv. *törögön, töröl, törel* «qohum, nəsil» və s. [87, 70; 91, 45].

11) **monq.:** kalm. *ikir*, xalx. *ixer*, bur. *exir* «əkiz, oxşar»; **türk.:** qaz. *egiz*, T. türk., *ekiz*, Azərb. *ekiz, äkiz*, xak. *ikis*, yak. *igire, igiri* «əkiz, oxşar» və s.

12) **monq.** *xatun, xatan*, xalx. *xatan*, ord. *xatn* «qadın, xanım»; **türk.:** Alt. *kadyn*, tat., türkm. *xatyn*, özb. *xatin*, uyğ. *hotun*, yak. *xotun*, qar.-balk. k*atyn*, noq. *xatyn*, Azərb. *gadyn*, xanım-*xatın* «qadın, xanım» və s. [91, 58; 126, 58].

13) **monq.**, bur., kalm. *xuda*, xalx. *xud* «quda, elçi»; **türk.:** qaz. *kuda*, *kudaγay*, qır. *kudo*, *kudagyj*, uyğ., özb. *kuda*, Azərb., türkm. *guda*, tat. *koda, kodagyj, kodača*, yak. *xodogoj* «quda, elçi, ər-arvadın valideynləri» və s. [87, 68; 91, 73].

14) **monq.,** xalx., kalm. *kürgen*, bur. *xürge(n)* «kürəkən, adaxlı»; **türk.:** baş. *kejäü*, qaq. *güvä*, qaz. *küjeü*, q.-qalp. *küjeü, küjeü bala*, qır. *küjöö*, tat. *kijaü*, tuv. *kudee*, T. türk. *güvej, güveji*, türkm. *giev, göregen*, özb. *küev*, uyğ. *kijoğul (kijö+oğul)*, xak. *kizö*, çuv. *keru*, yak. *kütüö, kütyöt*, Azərb. *küräkän* (Quba dialektində *küjov*, Culfada *kijäv*, Ağdaşda *kääv*, Xaldan və Qazaxda *köj*) və s. [87, 68; 91, 60].

15) **monq.,** kalm., bur. *baza*, xalx. *baz* «bacanaq, bacıların ərləri»; **türk.:** qır., tat., çuv., türkm., uyğ., şor., yak. *baža*, baş., qaz., q.-qalp., noq. *baža*, özb. *boža*, Azərb. *baǯanag*, qaq. *baǯanak*, T. türk. *bacanak*, qar.-balk. *baǯa* «bacanaq, bacıların ərləri» və s.

16) **monq.,** kalm., xalx., bur. *xadam* «ər və ya arvadın qohumu, qayın», xalx. *xadam eceg* «qayınata (arvadın atası)», xalx. *xadam ex*, bur. *xadam ežy* «qayınata (ərin atası)»; **türk.:** Alt., baş., qaq., qaz., q.-qalp., qır.., tat., T. türk., özb. *kaj(y)n*, qar.-balk., noq. *kajyn*, Azərb., türkm. *gajyn* «qayın, ərin və ya arvadın qardaşı», Azərb. *gajynana*, baş. *käjnä*, qaq. *kajnana//kajnna*, qaz., q.-qalp., qır., Alt., *kajyn ene* «qayınana» [87, 67; 91, 68; 126, 50].

17) **monq.,** kalm., bur. *xuda*, xalx. *xud* «quda, elçi»; **türk.:** Alt., qaz., q.-qalp., qır., tuv., özb., uyğ., şor. *kuda*, tat. *koda*, baş. *koza*, Azərb., türkm. *guda* «quda, elçi» və s. [87, 68].

***2. İnsanın bədən üzvlərinin adları:***

1) **monq.** *žirüxen*, bur. *žürxe(n)*, xalx. *žürx*, kalm. *zürken* «ürək»; **türk.**: qaz., qır., *žürek*, xak. *čürek*, Alt. *dürek*, özb., noq. *jurek*, türkm., T. türk. *jürek*, Azərb. *üräk*, çuv. *čere*, yak. *sürex*, qar.-balk. *ǯürek*; **tunq.-man.**: sol. *žurugu* «ürək» və s. [87, 75; 126, 22; 47, 36; 49, 24].

2) **monq**. *bügere,* bur. *bööre,* xalx. *böör*, kalm. *böörö* «böyrək»; **türk.**: qaz. *büjrek*, özb. *bujrak*, Azərb. *böjräk (böjür),* qır. *bojrek*, türkm. *bovrek*, T. türk. *bobrek*, uyğ. *börek*, xak. *pürek*, yak. *büör*, çuv. *püre*, qaraqalp. *büjrek*, tat. *böjräk* və s. [87, 74; 47, 30].

3) **monq.** *deligüü, deligün,* bur. *deljuu(n),* xalx. *delüü(ü),* kalm. *delün* «dalaq»; **türk.**; xak. *tölön*, Alt. *telüün, teemin, telin,* qaz. *talaķ*, uyğ. *tal*, özb. *talok*, türkm., T. türk. *dalak*, Azərb. *dalag*, yak. *taal*, qar.-balk., noq. çuv. *talak*; **tunq.-manc.**: evenk. *delkin* və s. [87, 83; 126, 25].

4) **monq**. *xele, xelen,* bur. *xele(n),* xalx. *xel(en),* kalm. *kele, kelen* «dil (danışıq orqanı)»; **türk.**: Azərb. *dil*, baş. *tel*, Alt., qaz., qaraqalp., qır., qum., noq., özb., uyğ., xak. *til*, tuv. *dyl*, çuv. *čelxe*, yak. *tyl* və s. [87, 83; 126, 25; 47, 44].

5) **monq**. *taŋnaj, taŋlaj*, bur. *tangalaj*, xalx. *tanglaj*, kalm. *taŋnaj* «damaq»; **türk.**: Azərb. *damag*, Alt., qaz., qır. *taŋdaj*, qar.-balk. *tynylavuk, tanglaj (taŋlaj),* noq., özb. *taŋlaj*, qum. *tanglav*, tuv. *taalaj*, uyğ. *taŋlaj*, yak. *taŋalaj*, T. türk. *damak*; **tunq.-manc**. evenk. *tangalaj**tanqilaj**tagala* və s. [87, 83; 126, 26; 47, 24-25; 48, 24].

6) **monq.**, bur., kalm. *xabirga* «qabırğa»; **türk.**: Azərb. *gabyrγa*, Alt., qır., noq., tat. *kabyrga*, baş.., qaz., qaraqalp. *kabyrγa*, qum., T. türk. *kaburga*, türkm. *gapyrga*, xak. *xabyrga* və s. [87, 76; 126, 23; 47, 32-33].

7) **monq**. *xöxön*, bur. *xüxe(n),* xalx. *xöx,* kalm. *kökön* «köks; əmcək»; **türk.**: Azərb. *köks,* Alt. *kögüs,* baş. *kükräk,* qaz. *kökirek*, T. türk. *göğüs,* özb. *kuks,* xak. *kögis,* qar.-balk. *kokrek, kökjürek,* noq. *kokirek,* tat. *kükräk,* çuv. *kakar* «köks, sinə»; **tunq.-manc**. evenk. *uku-n~huku-n~uku-ksun~huku-hu* «qadın döşü, əmcək», sol. *uxu, ukku-n* «ana südü», even. *ök-n~öke-n~uke-n~eken,* neqi. *öxö-n~ökän*, oroç. *oko-(n-)~uku-(n-),* udeq. *ōko-(n-),* ulç. *kue-(n-)~kū-(n-),* orok.

*kō-(n-)~kū-(n-),* nan. *kũ~kū-(n-),* manc. *xuxu-n*, cjur. *hūh-hû-n* «qadın döşü; ana südü»; **korey**. *čot-kkokči* «qadın döşü»; **yap.** *kökörö* «ürək» və s. [87, 78-79; 126, 23; 47, 12; 48, 24; 56, 140-144].

8) **monq**. *am(an),* bur. *ama(n),* kalm. *amn* «ağız; cəhəng (heyvanlarda)»; **türk.**: Azərb. *aγyz*, Alt. *ōs*, baş., qaz., qaraqalp. *ajyz*, qum. *avuz*, qır. *ōz*, noq., tat. *avyz*, türkm. *agyz*, uyğ. *eγiz*, xak. *ās*, çuv. *čavar*; **tunq.-manc**. evenk. *amŋa-amma*, even. *amŋ~amga ~amŋa~aŋ*, neq. *amŋa*, oroç. *amma*, udeq. *aŋma*, orok. *amŋa*, nan. *amŋa~aŋma~amga~amge*, sol. *amma*, cjur. *ān-hah(kā)*, manc. *aŋġa* «ağız; cəhəng, dimdik» və s. [56, 145; 47, 34-35; 69, 27].

9) **monq**., bur., kalm. *gar* «qol»; **türk.**: qədim türk. *gar, garï* «qolun dirsək oynağı», Alt., qır. *kary* «qolun yuxarı hissəsi; qol, çiyin», özb. *kary* «qol», uyğ., oyr. *kary* «qolun yuxarı hissəsi», yak. *xara~xary* «dirsəklə pəncə arasındakı hissə, bazu önü», qar.-balk., noq. *kary* «dirsək», tuv., xak. xal, Alt., qır. *kol*, Azərb. *gol* «qol»; **tunq.-manc**.: evenk., orok., nan. *gara*, neq. *gaja<gara*, even., sol. *gar<gara*, oroç., udeg. *gā<gaja<gara*, ulç. *gara* «budaq, zoğ, qol, son, uc və s.» [87, 76; 56, 146; 126, 23; 127, 15].

10) **monq**., bur., xalx., kalm. *adag* «son, uc, çıxış; çayın ağzı; ayaq»; **türk.**: Azərb. *ajag*, baş., qır., qum., noq., tat., T. türk. *ajak*., qaz., qaraqalp., uyğ. *ajak'*, özb. *ojok'*, xak. *azax*, yak. *atak* «ayaq» və s. [87, 71; 126, 19; 47, 25].

11) **monq.** *tabxaj* «pəncə, ayaq», bur. *tabgaj* «ayağın altı, pəncə», xalx. *tabag*, *tavxaj* «ayağın altı, pəncə», kalm. *tabag* «pəncə, insanın və ya heyvanın ayağının alt hissəsi»; **türk**.: Azərb., türkm. *daban*, Alt. *taman*., baş., qaz., qaraqalp., qum., noq., tat., T. türk., xak. *taban*, qır. *taman*, özb. *tobon*., tuv. *tavaŋgaj*, uyğ. *tapan*, çuv. *tupan* və s. [87, 82; 126, 25; 47, 38].

12) **monq**., kalm. *aru*, xalx. *ar*, bur. *ara* «arxa, dal, el, kürək»; **türk.**: Azərb. *arxa*, Alt., baş., qır., qum., noq., T. türk., türkm. *arka*, qar.-balk., uyğ., özb. *ark'a*, xak. *arγa*; **tunq.-manc.**: evenk. *arka(n)* «arxa, çiyin» və s. [87, 71; 126, 19; 47, 38; 48, 24].

13) **monq**. *bileceg~bilucug (bilceg)*, bur. *behelig*, kalm. *biltsäg-~bültsäg* «halqa, üzük; bilək», **türk**.: qədim türk., Azərb., uyğ. *biläk*, Alt. *belek*, baş. *beläk*, qaz., qır., qum., noq., tuv., T. türk., türkm. *bilek*, xak. *pilek* «bilək»; qədim türk. *biläzük*, T. türk. *bilezik*, baş., tat. *belezek*, qır. *bilezik*, Azərb. *bilärzik* «qolbağ, bilərzik», **tunq.-manc.**:evenk. *bilēn*, even. *bīlen*, udeq. *bule* «bilək», even. *bīleptun*, sol. *ʒilaptun*, even. *bīlepen*, udeq. *buleptu*, ulç. *gileptu(n)* «qolbaq, bilərzik» [56, 150; 47, 31].

14) **monq**.: kalm. *beje*, xalx. *bie*, bur. *bēe* «bədən, boy, orqanizm», **türk.**: qaz. *boj* «qədd-qamət, boy-buxun, gövdə, bədən», Alt. *boj* «özü», yak. *bäjä* «bədən», xak. *pos*, Azərb., uyğ. *bädän*, qaraqalp., T. türk., türkm. *beden* və s. [87, 72; 47, 39].

15) **monq**., kalm. *maŋnaj*, xalx., bur. *magnaj*, *manlaj* «alın», **türk.**: Alt., qaz., qır. *mandaj*, baş., tat., türkm., uyğ. *maŋlaj*, qaraqalp. *manglaj*, qum. *mang'aj*, noq. *man'laj*, özb. *manglaj* «alın» və s. [87, 80; 47, 23].

16) **monq**. *nidurga*, bur. *njudarga(n)*, xalx., kalm. *nudurga* «yumruq», **türk.**: Azərb. *jumrug*, Alt. *judrek*, baş. *jozrok*, qaz. *žudyryk*, qaraqalp. *žudyryk'*, qır. *žuduruk*, qum. *jumuruk*, tat. *joduruk*, tuv. *čuduruk*, xak. *nuzuruk*, **tunq.-manc**.: evenk. *nidurga* «yumruq» və s. [87, 80; 47, 20; 48, 24].

17) **monq.** *saxaltaj*, bur. *haxal*, kalm., xalx. *saxal* «saqqal», **türk.**: Azərb. *saggal*, Alt. *sagal*, türkm. *sakgal*, xak. *saγal*, baş. *hakal*, qaz., qaraqalp., qır., qum., noq., tat., uyğ. *sakal*, özb. *sokol*,

